ilə tanınan İbn Əbd Rəbbihdir. *"İqd Əl Fərid"* kitabı isnadsız bir ədəbi əsər olub ehtiva etdiyi kriteriya yalnızca onun ərəbcə olmasıdır.

**Şübhə 7:**

İmam Əl Xavərəzmi *"Məqatil əl Hüseyn"*də detaylı bir şəkildə Muaviyyənin Əliyə lənət etdiyi və söyüş söydüyünü yazır.

**Cavab:**

Xavərəzmi şiədir, bəlkədə o bu kitabı təqiyyə altında yazmışdır. Nə olursa olsun, onun digər kitabı onun şiəliyinə dəlildir. Onun haqqında burada daha geniş məlumat ala bilərsiniz.

http://www.alsrdaab.com/vb/showthread.php?t=52665

**Şübhə 8:**

Hz.Həsən (r.a) Hz.Muaviyyə (r.a) tərəfindənmi zəhərlənmişdir?

**Cavab:**

**Cavab 1:**

Bu iddia bəzi səbəbələrə görə yanlışdır:

**1.** Hz.Muaviyyənin Hz.Həsəni zəhərlətdiyinə dair heç bir açıq dəlil yoxdur və isbatlanmamışdır. Biz bu

barədə siqə ravilərdən bizə bir şey çatmamışsa qəbul etmərik.

**2.** Nəql edilmişdir ki, Hz.Həsəni zəhərləyən Hz.Muaviyyə deyil də Hz.Həsənin öz xanımı Cudə olmuşdur. Həmçinin nəql edilmişdir ki, Hz.Həsəni zəhərləməsini onun qaynatası Əl Qəşas ibn Qeys ona əmr etmişdir. Bəzi nəqllərdə deyilir ki, bunu əmr edən Muaviyyə idi yaxud da Yezid idi. Siqə ravilərdən yoxsun olması səbəbindən Hz.Həsəni zəhərləyənin kim olduğunu göstərən bu təzadlı rəvayətləri zəiflətməkdədir.

**3.** Məntiq, Hz.Həsənin Hz.Muaviyyə ilə sülhü rədd etməsi və hakimiyyəti istəməsi səbəbindən Hz.Muaviyyənin onu zəhərlətdi yönündəki rafizilərin bu argumentlərini qəbul edərdi. Lakin bunun əksinə olaraq Hz.Həsən onunla sülh müqaviləsi bağlamış və xilafəti Hz.Muaviyyəyə vermişdi. Bu səbəblə, Hz. Muaviyyə niyə Hz.Həsəni zəhərlətsin ki?

**4.** Həqiqətdə nə İmam Hüseyn nə də İmam Həsən gerçək günahkarların kim olduğunu bilədi, onlar bunu bilmədikləri halda digərləri Hz.Həsəni kimin zəhərlədiyini necə biləbilər ki?

Hz.Həsən zəhərlənib ölüm yatağına düşdüyündə qardaşı Hz.Hüseyn ona gələrək dedi: "Ey Qardaşım, söylə mənə səni kim zəhərlədi?".
Hz.Həsən soruşdu: "Niyə? onu öldürəsən deyəmi?".

Hz.Hüseyn dedi: ”Bəli”.
Hz.Həsən cavab verdi: ”Sənə heç bir şey söyləməyəcəyəm. Əgər o kimsə mənim düşündüyümdürsə o zaman Allahın intiqamı daha şiddətlidir. Yox, elə deyilsə o zaman Allaha and olsun ki, heç bir günahsız insan mənim səbəbimdən öldürülməyəcək”. (Əl-Bidayə vən-Nihayə cild. 7 s. 41; Siyər A'ləm ən-Nubəla cild. 3 s. 273)

**Cavab 2:**

İmam Zəhəbi *“İstiab”*da “bəzi insanlar dedilər ki, İmam Həsən Muaviyyə tərəfindən zəhərlənmişdir” sözünü sitat gətirdikdən sonra deyir:

قلت هذا شيء لا يصح

“Deyirəm ki, bu doğru deyildir”. *(Zəhəbi,Tarixul İslam, 3/40)*

**2.** Sonra rafizilər Təbəraninin *“Mucəmul Kəbir”*-ində cild 3, səh 119, hədis no 2628-də keçən bu nəqli dəlil olaraq gətirməyə çalışırlar:

عن أبي بكر بن حفص ، أن سعدا والحسن بن علي رضي الله تعالى عنهما ماتا في زمن معاوية رضي الله تعالى عنه ، فيرون أنه سمه

“Muhəmməd ibn Abdullah əl Hədrami Muhəmməd ibn Abdullah ibn Numeyrdən o da Yəhya ibn Əbu Bəkrdən o da Şübədən o da Əbu Bəkr ibn Həfsdən

nəql etdi ki, (Səd və Hz.Həsən) Muaviyyənin zamanında öldü və bu səbəbdən bəzi insanlar fikirləşdilər ki, o (Muaviyyə) onu zəhərləmişdir".

Sadəcə Hz.Muaviyyənin xilafəti zamanında Hz. Həsənin ölmüş olması Hz.Muaviyyənin onu zəhərlətməsinə necə dəlil ola bilərki? Rafizilərin dəlil olaraq önə sürdüyü bu şey dəlildən çox təxminə dayanmaqdadır. Çünki rəvayətin sonunda deyilməkdədir ki: "Onlar düşünürdülər ki, O (Muaviyyə) onu ( Hz. Həsəni) zəhərləmişdir". Soruşmaq gərəkdir ki, axı kimdir bu "bəziləri"? Bu nə yazarın, nə də ravinin fikridir, sadəcə bilinməyən bir qrupun fikridir.

Həmçinin qeyd etmək lazımdır ki, rəvayətin sonuncu ravisi olan Əbu Bəkr ibn Həfslə, Hz.Həsən, Muaviyyə və Sad arasında olduqca böyük bir zaman aralığı vardır. Çünki o, Abdullah İbn Əl-Həsən əl-Müsənna ibn əl-Həsən əs-Sibt ibn `Əli ibn Əbu Talib kimilərdən rəvayətlər etmiş və onların çağdaşı olmuşdur.

Yəni, qısaca özətlərsək, Hz.Həsən Hz.Muaviyyənin zamanında öldüyü üçün bəzi insanlar Hz.Muaviyyənin onu zəhərlədiyini düşünmüşlər. Bu dəlil olamaz. İkinci olaraq, bu bəziləri kimlərdir axı?
Üçüncü olaraq isə bu rəvayət qopuqdur.

**3.** Buna bənzər bir rəvayəti İbni Əsakir öz *"Tarix ibn Əsakir"*ində isnadsız olaraq nəql edir. Lakin onun is-

nadını *"Tarixi Mədinətül Diməşq"*də (cild 13, səh 283-284)-də verir ki, isnadı belədir.

Muhəmməd ibn Sad-Muhəmməd ibn Ömər-Abdul-lah ibn Cəfər-Abdullah ibn Həsən.

İsnadda olan ravi Muhəmməd ibn Ömər əl Vaqidi uləmanın nəzdində cərh olunmuş zəif bir ravidir.

Əli ibn Mədaini rahiməhullah Vaqidi haqqında demişdir: "O, hədisləri təhrif edir" *(İbid., səh.110, İbn Həcər, Təhzib, səh.366)*
İbni Adi rahiməhullah: "Onun hədisləri mötəbər deyil və ondan hədis qəbul etmək təhlükəlidir".
*(Əz Zəhəbi, Mizan, cild.3, sh.110)*
İbni Həcər rahiməhullah: "O, tərk edilmişdir". *(İbn Həcər əl-'Əsqəlani, Təhzib ət-Təzhib, cild.9 sh.366 No. 604 )*

Əbu Zura ər Razi rahiməhullah: "Tərk edilmişdir və zəifdir". *(İbn Əbu Hatim, cild.4, h.1, sh.21)*
İmam Nəvəvi rahiməhullah: "Onların (Muhəddislərin) Vaqidinin zəif olduğuna dair icmaları vardır".
*(İbn Həcər, Təhzib, cild.9, sh.366)*
İmam Buxari rahiməhullah: "Vaqidi tərk edilmişdir. O, hədisləri təhrif edərdi". *(Əz Zəhəbi,Mizan,cild 3 səh 110)*
İmam Şafi rahiməhullah: "Vaqidinin bütün kitabları yalandır. Mədinədə 7 adam təhrif edərdi onlardan biridə Vaqididir." *(İbn Əbi Hatim, cild.4 hissə.1*

*səh.21)*

İmam Əhməd rəhimahullah: ”O, Kəzzabdır (yalançıdır). Nəqllərdə tədlis edər”. *(Əz-Zəhəbi, Mizan, cild. 3 səh.110)*

**4.** Rafizilər Məsudinin *“Muruc əz Zəhəb”*-indən bir rəvayəti dəlil olaraq gətirməkdələr. Lakin, bilmək lazımdır ki, Məsudi Əhl'i Sünnət alimi deyildə şiə'dir. Rafizi alimləri onun haqqında belə yazmaqdadır:

Şiə Ayətullah Şeyx Abbas Qummi, *”Kitab əl Kunu vəl Əlqaab”*-ında yazır:

شيخ المؤرخين وعمادهم أبو الحسن علي بن الحسين بن علي المسعودي الهذلي العالم الجليل

Tarixçilərin Şeyxi, Əbul Həsən Əli bin Hüseyn ibn Əli əl Məsudi, böyük bir alim. (*Kunə vəl Əlqab, cild. 3, s. 184-185)*

http://www.yasoob.com/books/htm1/m025/29/no2926.html

Molla Baqir Məclisi Məsudi haqqında deyir:

والمسعودي عده النجاشي في فهرسته من رواة الشيعة

Nəcaşi fihristində onu şiə ravisi hesab etmişdir. *(Bihar ul Ənvar cild. 1, s. 36)*

Digər bir rafizi alimi Səid Bəhrul Ulum *“Fəvaid ər-Ricaliyyə”* (4/150)-sində deyir:

ومنهم الشيخ الفاضل الشيعي على بن الحسين ابن علي المسعودي مصنف كتاب مروج الذهب

“Və onlardan Əl Fadl Şiə Əli ibn Əl-Hüseyn ibn Əli əl-Məsudi, *“Muruc əz-Zəhəb”* kitabının yazarı.

Rafizi alimi Şəhrudi *“Müstədrəkət ilmul rical əl-hədis”* (5/352)-də yazır:

9929 – علي بن الحسين بن علي المسعودي أبو الحسن الهذلي : من أجلاء علمائنا الإمامية صاحب كتاب مروج الذهب ورسالة إثبات الوصية لعلي بن أبي طالب ع وغيرهما

Əli ibn əl-Hüseyn əl-Məsudi Əbul Həsən əl-Huzali: İmamiyyə alimlərimizdən, *“Muruc əz-zəhəb”* və risalət *“İsbat əl-vəsiyyə li Əli ibn Əbu Talib”* (əleyhissalam) və digərlər (kitabların) yazarı.

İbni Teymiyyə isə Məsudi haqqında belə deməkdədir:
وفي تاريخ المسعودي من الأكاذيب ما لا يحصيه إلا الله تعالى
Məsudinin Tarixində Sadəcə Allahın sayısını bildiyi qədər yalanlar vardır. *(Minhac us Sunnə, 4/84)*

**5.** Rafizilər dəlil olaraq digər bir nəqli isə Əbul Fərəcin *“Məqatil”*indən gətirməkdədirlər ki, Əbul Fərəcin özü də Əhl'i Sünnət alimi deyildə Zeydi şiələrindən-

dir.

Rafizi alimi Ağa Bozorg Tehrani onun Məqatil kitabı haqqında yazır:
ويظهر من مواضع منه أنه شيعي زيدي المذهب “Onun içindəki bir neçə nüansdan da aydın olur ki, o şiə idi  və Zeydi məzhəbinə bağlı idi.” (Əz-Zəriə ilá Təsanif əş-Şiə, *of Ağa Bozorg ət-Tehrani (v. 1389), cild 21, səh 376 (Beyrut)*

Rafizi Alimi ibn Mutəhhər əl Hilli Məqatilin yazarı Əbul Fərəc Əl İsfəhani haqqında belə deməkdədir:
أبو الفرج الأصفهاني زيدي المذهب “Əbul Fərəc əl İsfəhani, Zeydi məzhəbindəndir”. (Xülasət əl-Əkvāl fī Mərifət əl-Rical, *İbn Mutəhhər əl -Hillī (v. 726), səh 421 ( Qum)*

**6.** *"Əl Bidayə vən Nihayə"*-də İmam İbni Kəsir Hz. Həsənin Hz.Muaviyyə tərəfindən zəhərləndiyi rəvayətini sitat gətirdikdən sonra bunun doğru olmadığını söyləməkdə və bunu nə Yezid nə də onun atasının etməsi doğru deyildir deməkdədir. (*Əl-Bidayə vən-Nihayə cild. 7 s. 41)*

**7.** Rafizilər *"Tarix İbnul Xamis"*i bu barədə referans olaraq gətirməkdədilər ki, bu kitabda da Hz.Muaviyyənin Hz.Həsəni zəhərlədiyinə dair heç bir şey yoxdur.

**8.** İmam Zəhəbinin Siyərində bu barədə gələn rəva-

yətin sənədində Muhəmməd ibn Ömər Əl Vaqidi vardır ki, yuxarıda da zikr etdiyimiz kimi, o zəif bir ravidir.

**9.** Rafizilərin bu barədə dəlil olaraq gətirdikləri digər bir rəvayət isə Sibt ibnul Cəzvinin *"Təzkirətul Xəvvas "* kitabındandır. Lakin yenə də qeyd etmək istəyirəm ki, bu bizim üçün dəlil deyildir. Sibt ibnul Cəzvinin özü uləma tərəfindən cərh edilmiş bir kimsədir və rafizidir.

İmam Zəhəbi onun haqqında yazır:

سبط ابن الجوزى. روى عن جده وطائفة، وألف كتاب مرآة الزمان، فتراه يأتي فيه بمناكير الحكايات، وما أظنه بثقة فيما ينقله، بل يجنف ويجازف، ثم إنه ترفض. وله مؤلف في ذلك. نسأل الله العافية. مات سنة أربع وخمسين وستمائة بدمشق. قال الشيخ محيى الدين السوسى: لما بلغ جدى موت سبط ابن الجوزى قال: لا رحمه الله، كان رافضيا.

"O, (*Mirətuz Zaman*) kitabını yazmışdır və oraya bir çox münkər rəvayətlər daxil etmişdir. Rəvayət etdiyi şeylərdə etibarlı olduğunu düşünmürəm, əksinə (nəql etdiklərində) aşırıya getmiş və kənara çıxmışdır. O, sonra rafiziliyi qəbul etmişdir. Şeyx Muhiyiddin dedi: "Sibt ibnul Cəzvinin ölüm xəbəri babama çatanda o dedi: "Allah ona rəhmət etməsin, o rafiziydi". *(Mizanul İtidal, 4/71)*

*"Təzkirətül Xəvvas"* yazarı Sibt ibnul Cəzvi hicri 654 -də ölmüşdür. Nə kitab nə də yazarı etibarlı deyildir.

Bununla yanaşı bu kitabda Hz.Muaviyyənin Hz.Həsəni zəhərlətməsiylə bağlı gətirilən nəqlin isnadı yoxdur. Sibt ibnul Cəzvi Şubəni görməmişdir, onların arasında 400 il qədər bir zaman aralığı vardır.

Zəməxşərinin *"Rəbiul Əbrar"*ında cild 4, səh 208-də bu barədə gətirilən nəqlə gəlincə isə, bu rəvayətində həmçinin isnadı yoxdur və yazarın özüdə hicri 538-ci ildə vəfat etmişdir. Yəni, bu kitabda bu barədə gələn rəvayət isnadsızdır və yazarın özüdə Şubəni görməmişdir.

Əgər bu baş vermişsə Hz.Həsnin xanımı Cudə binti Əşasında buna daxil olmuş olması mümkün görünmür. Çünki, Cudə Hz.Həsənin vəfatından sonra Abdullah ibn Abbas ilə evlənmişdir ki, buda Hz. Həsənin Hz.Muaviyyə,Yezid yaxud da onun xanımı Cudə bint Əşas tərəfindən zəhərlənməsinə dair iddiaları sual altına almaqdadır. Ən azından Abdullah ibn Abbas ondan şübhə duymadığını göstərməkdədir. Abdullah ibn Abbasın ondan Muhəmməd adında bir oğlu və Qureybə adında bir qızı olduğunu İbni Sadın *"Təbəqat əl Kübra"*-sında (5/241)-də görməkdəyik.

Hz.Həsən Hz.Muaviyyəyə beyət etdi, Hz.Hüseyni savaşı sonlandırmağa razı salan ilk şəxs də Hz.Həsəndir. Hz.Həsən Hz.Muaviyyənin hakimiyyətinə məşruiyyət verdi və xilafəti tamamən tərk edərək

Mədinədə sülh içində yaşadı. O, Muaviyyəyə qarşı çıxmadı və kimsəni də ona qarşı üsyan etməsini istəmədi. Əksinə onların Muaviyyəyə qarşı savaşmasına mane oldu.

Hz.Həsən Hicri 49-cu ildə 40 günlük bir xəstəlikdən sonra vəfat etdi. Hz.Muaviyyə isə hicri 40-cı ildə xilafətə gəldi və onun xilafəti hicri 60-da sona ərdi. Yəni, Hz.Muaviyyə xilafətə gəlməsindən 10 il sonra anidən Hz.Həsəni niyə zəhərlətmək istəsin ki?

Əgər deyilsə ki, Hz.Muaviyyə Hz.Həsəni zəhərlətdi ki, onun oğlu hakimiyyətə keçsin. O zaman deyərik ki, bu anlamsızdır, çünki Hz.Hüseyn hələ həyatda idi və Hz.Əlinin bütün şiələri Hz.Hüseynə gedərlərdi. Digər bir deyişlə İbn Ömər və İbn Zubeyr kimi namizədlər var idi ki, onlara heç kim zərər verməmişdi.

Məntiqlə düşünülsə görərik ki, Xəvariclərin (eks şiələrin) Hz.Həsəni öldürmək üçün bütün səbəbləri var idi, çünki onlar Hz.Həsəni Hz.Muaviyyə ilə sülh bağladığı üçün kafir olaraq görürdülər. Onlar Hz. Hüseynə nifrət etmirdilər, çünki Hz.Hüseyn sülhə qarşıydı. Eynilə nə də xilafət üçün İbn Ömər və İbn Zubeyr kimi namizədlərə qarşı deyildilər. Həmçinin şiənin öz tarix kitablarında Hz.Həsəni etdikləri şeylərə görə öldürmək istəyən öz şiələrinin olduğunu söyləyən nəqllər mövcuddur.

Gerçək budur ki, nə Hz.Həsən nə də Hz.Hüseyn gerçək faillərin kimlər olduğunu biləmədilər, bu halda Hz.Həsəni kimin zəhərlədiyini başqa biri necə bilə bilər ki?

Hz.Həsən zəhərlənib ölüm yatağına düşdüyündə qardaşı Hz.Hüseyn ona gələrək dedi: "Ey qardaşım, söylə mənə səni kim zəhərlədi?".
Hz.Həsən soruşdu: "Niyə? onu öldürəsən deyəmi?".
Hz.Hüseyn dedi: "Bəli".
Hz.Həsən cavab verdi: "Sənə heç bir şey söyləməyəcəyəm. Əgər o kimsə mənim düşündüyümdürsə o zaman Allahın intiqamı daha şiddətlidir. Yox, elə deyilsə o zaman Allaha and olsun ki, heç bir günahsız insan mənim səbəbimdən öldürülməyəcək".
*(Əl-Bidayə vən-Nihayə cild. 7 s. 41; Siyər A'ləm ən-Nubəla cild. 3 s. 273, Əl İsabə cild 2 s. 13, Əl İstiab cild 1 səh 390)*

Qeyd etmək lazımdır ki, İmam Hüseyn hicri 51-ci ildə Hz.Muaviyyə zamanında Konstantiniyyə (İstanbul) savaşında iştirak etmişdir. İmam Həsən isə hicri 50-ci ildə vəfat etmişdir. Bu da özlüyündə Hz. Həsənin Hz.Muaviyyə tərəfindən zəhərlədildiyi iddiasını zəiflətməkdədir. Çünki Hz.Hüseyn qardaşı Həsənin vəfatından 1 il sonra Hz.Muaviyyənin təşkil etdiyi ordunun nəzdində savaşa qatılmışdır.

İmam Zəhəbi, İbni Kəsir və İbn Xaldun kimi böyük

alimlər və tarixçilər Hz.Muaviyyəyə qarşı edilmiş bu əsilsiz ittihamları rədd etmişlərdir. Gerçək budur ki, Hz.Muaviyyənin Hz.Həsəni zəhərlətdiyinə dair bir dəlil yoxdur. Əgər bu barədə dəlil varsa sağlam bir isnadı olması gərəkməkdədir. Çünki, isnadsız bir şəkildə gələn rəvayət məqbul deyildir. İkinci olaraq " bəzi insanlardan eşitdim" ki, yaxud da "bir qrup insan dedi" ki, sözləri dəlil təşkil etməz və bu da özözlüyündə nəqlin olduqca zəif olduğunu göstərməkdədir. Çünki, bu bəziləri bizlərə görə məchul kimsələrdir. İmam Həsənin Hz.Muaviyyə tərəfindən zəhərləndiyi iddia edilərsə bunun Muaviyyənin etdiyi nəticəsinə gəlmək yanlış olar. Dolaysıyla bunun Abbasilər (750-1258) zamanında Əməvilərə (659-750) qarşı olan kin səbəbindən uydurulmuş yalanlardan biri olduğu nəticəsinə gəlmək olar. Çünki, Abbasilər Əməvilərin varlığına son qoymuş və onlara qarşı mənfi bir görüşdə tərbiyələnmişdilər.

**Şübhə 9:**

Hz.Muaviyyə Hz.Həsənin ölümünə sevindimi?

**Cavab:**

Rafizi saytlarında gələn bu rəvayətlərin demək olar ki, hamısı isnadsızdır. İsnadsız bir rəvayətdə başsız bir bədən kimidir. Yəni, bu rəvayəti istəyən istədiyinə isnad edə bilər. İmam Şafii isnadız rəvayəti qəbul

edən kimsəni gecə qaranlığında odun yüküylə birlikdə içində xəbəri olmadan ilan daşıyan birinə bənzətmişdir, necə ki, ilan onu hər an çalabilər".
*(Əl-Beyhəqi, Əl-Mədaxil ila əs-Sunən əl-Kubra, s 211)*

Rafizilərin, Əbu Davudda və Müsnəd Əhməddən gətirdikləri Muaviyyə əl-Miqdama dedi: Həsən ibn Əlinin öldüyünü bilirsənmi? əl-Miqdam dedi: "İnnə lilləh və innə ileyhi raciun". Bir kişi (Muaviyə ibn Əbu Sufyan) ona dedi: Sən onun ölümünü müsibətmi sayırsan?! Olan rəvayətin sənədində Bəqiyyə ibn Vəlid vardır ki, o uləmanın nəzdində cərh edilmişdir.

قال ابن حبان: لا يحتجّ ببقيّة.

وقال أبو مسهر: أحاديث بقية ليست نقيّة، فكن منها على تقيّة.

وقال أبو حاتم: لا يحتجّ به.

وقال ابن عيينة - وقد سئل عن حديث من هذه الملح -: أنا أبو العجب، أنا بقية بن الوليد.

وقال ابن خزيمة: لا أحتجّ ببقية.

وقال أحمد: توهمّت أن بقية لا يحدث المناكير إلا عن المجاهيل، فإذ هو يحدّث المناكير عن المشاهير، فعلمت من أين أتى.

وقال وكيع: ما سمعت أحداً أجرأ على أن يقول: قال رسول الله، من بقية.

وقال شعبة: بقيّة ذو غرائب وعجائب ومناكير.

وقال ابن القطّان: يدلس عن الضعفاء ويستبيح ذلك وهذا مفسد لعدالته.

وقال الفيروزآبادي: بقيّة محدّث ضعيف.

قال الزبيدي: محدّث ضعيف يروي عن الكذابين ويدلّسهم، قاله الذهبي في الميزان.

وقال الذهبي: قال غير واحد: كان مدلّساً، فإذا قال: عن، فليس بحجّة

وقال ابن العربي المالكي بشرح الترمذي : حكم أبو عيسى بصحته، وفيه بقية بن الوليد، وقد تكلم فيه

وقال البوصيري في "الزوائد" هو ابن الوليد، مدلس

قال المنذري : وفيه مقال

Görüldüyü kimi ulәmadan İbni Hibban, Əbu Hatim, İbni Xuzeymә vә s. Kimilәr Bәqiyyәni höccәt saymamış vә Buseyri, Zәhәbi kimi alimlәr onun müdәllis olduğunu zikr etmişlәrdir.

Yәni, bu barәdә nәql edilәn rәvayәtlәrin bir çoxunun isnadı yoxdur, isnadı olanlarında isnadlarında ciddi problemlәr mövcuddur. Ayrıca, biz İbni Kәsirin *"Əl Bidayә vәn Nihayә"*sindә görmәkdәyik ki, Hz. Hәsәn vәfat etdiyindә Hz.Muaviyyә İbni Abbasa tәziyyә üçün öz oğlu Yezidi göndәrmişdir:

ولما جاء الكتاب بموت الحسن بن علي اتفق كون ابن عباس عند معاوية فعزاه فيه بأحسن تعزية، ورد عليه ابن عباس ردا حسنا كما قدمنا

وبعث معاوية ابنه يزيد فجلس بين يدي ابن عباس وعزاه بعبارة فصيحة وجيزة، شكره عليها ابن عباس

"Və Həsən ibn Əlinin (r.a) ölüm xəbərini elan edən məktub gəldiyində İbn Abbas Muaviyyəylə birlikdə olduğundan, o (Muaviyyə) ona (İbni Abbasa) ən yaxşı şəkildə başsağlığı verdi və İbni Abbasda ona daha öncə zikr etdiyimiz kimi ən yaxşı şəkildə cavab verdi O, oğlunu (Yezidi) İbni Abbasla oturması üçün göndərdi və o da qısa və anlamlı ifadələrlə başsağlığı verdi. İbni Abbas da ona təşəkkür etdi".

*(Əl Bidayə vən Nihayə, cild 8 , səh 304)*

**Şübhə 10:**

"İmam Əli Siffində dedi: "Mən Rasulullaha (s.a.s) heç vaxt imtina etməyəcəyim bir söz verdim. Sizin düşmənləriniz yaxınlaşır, o münafiqdir və münafiqin oğludur. O, dəstəklərini cəhənnəm atəşinə dəvət edir və sizin aranızda Rasulullahın (s.a.s) əmi oğlusu vardır, bilirsiniz ki, mən Rasulullahla (s.a.s) ilk namaz qılan kimsəyəm. Muaviyyə azad olunmuş əsir və əsirin oğlu ikən mən bədr əhli arasındaydım. Vallahi , biz haqq üzrə onlar isə batil üzərindələr".

*(Vaqiət Siffin səh 314, Şərh İbn Əbi Hədid, cild 5, səh 245 )*

**Cavab:**

Qeyd etmək lazımdır ki, verilən qaynaqlardan heç

biri Əhl'i Sünnət qaynaqlarından deyildir. *"Vaqiət Siffin"* yazarı Nəsr ibn Müzəhhim ibn Səyyar əl Əttar əl Minqar əl Kufi (v.212 h) Əhl'i Sünnə alimi deyil, əksinə şiədir.

İmam Zəhəbi *"Mizanul İtidal"*-da onun haqqında yazır:

نصر بن مزاحم الكوفي عن قيس بن الربيع وطبقته رافضي جلد تركوه مات سنة اثنتي عشرة ومائتين حدث عنه نوح بن حبيب وأبو سعيد الأشج وجماعة قال العقيلي شيعي في حديثه اضطراب وخطأ كثير وقال أبو خيثمة كان كذابا وقال أبو حاتم واهي الحديث متروك وقال الدارقطني ضعيف

"Nəsr ibn Müzəhhim əl Kufi: Qeys ibn Rəbidən və onun kategoriyasından olan (digərlərindən) rəvayət etmişdir. Qatı Rafizidir və tərk edilmişdir. İki yüz iyirmi ilində vəfat etmişdir. Nuh ibn Əl Həbib, Əbu Səid əl Əshac və bir qrup ondan rəvayətlər etmişdir. Əl Uqeyli dedi: "Şiə'dir". Nəqllərində tutarsızlıqlar və xətalar vardır. Əbu Xeytəmə dedi: "O yalançıdır".
Əbu Hatim dedi: "Rəvayətlərində mətrukdur" və Dəraqutni dedi ki, zəifdir. (Mīzān əl-İtidāl fī Nəqd ər-Ricāl, *Şəmsuddin əz-Zəhəbi (v. 748), cild 4, səh 253-254 (Beyrut))*

Rafizi alimi Nəcaşi, Nəsr İbn Müzəhhim haqqında yazır:

**نصر بن مزاحم المنقري العطار أبو المفضل كوفي مستقيم الطريقة صالح الامر غير أنه يروي عن الضعفاء كتبه حسان**

“Nəsr ibn Müzəhhim Əl Minqari əl Əttar, Əbu əl Müfəddəl, doğru yolda və saleh (bir kimsədir). Zəif kimsələrdən rəvayətlər etmişdir, kitabları gözəldir”. *(Nəcaşi, Əl Fihrist, səh 427-428, Qum)*

Digər qaynaqda göstərilən İbn Əbi Hədid eynilə Əhl'i Sünnət alimi deyildə Mötəzilə məzhəbindən olan kimsədir. Onun özü öz əqidəsinin Mötəzili olduğunu bildirməkdədir.

واختلف الناس في إيمان أبى طالب فقالت الامامية وأكثر الزيدية : ما مات إلا مسلما.
وقال بعض شيوخنا المعتزلة بذلك ، منهم الشيخ أبو القاسم البلخي وأبو جعفر الإسكافي وغيرهما
شرح نهج البلاغة - ابن أبي الحديد - ج 14 - ص 65 – 66

"Müsəlmanlar Əbu Talibin imanında ixtilaf ediblər: Bütün İmamiyə və Zeydi məzhəbinin əksəriyyəti qaildilər ki, o, müsəlman olaraq dünyadan gedib. Və bizim mötəziliyə ustadlarımızdan bəziləri məsələn Şeyx Əbul Qasim Bələxi və Əbu Cəfər Əskafi və bu iki nəfərdən başqalarıda bu əqidədə olub." *(İbn Əbi Hədid, Şərh Nəhcul Bələğa, cild 14, səh 65-66)*

Görüləcəyi üzərə hər iki qaynaq da nəzdimizdə dəlil təşkil etməz, çünki, bu alimlər Əhl'i Sünnətdən deyildə digər məzhəbin nümayəndələridir.

**Şübhə 11:**

Rafizi saytları yazır "Həzrəti Aişə Muaviyyə tərəfindən öldürülmüşdür". *(Nəcibabadi, Tarixul İslam, cild 2 , səh 44)*

**Cavab:**

Qeyd etmək lazımdır ki, həqiqətdə Nəcibabadinin kitabında bu ifadə yoxdur. O, gerçəkdə belə yazmaqdadır:



**سنہ ۵۸ھ میں حضرت ام المومنین حضرت عائشہ صدیقہ رضی اللہ عنہا فوت ہو کر البقیع میں مدفون ہوئیں آپ مروان کی مخالفت کیا کرتی تہیں کیونکہ اس کے اعمال اچھے نہ تھے مروان نے ایک روز دھوکے سے دعوت کے بہانے سے بلا کر ایک گڑھے میں جس میں ننگی تلواریں اور خنجر وغیرہ رکھ دیئے تھے آپ کو گرا دیا تھا آپ بہت ضعیف اور بوڑہی تھیں زخمی ہوئیں اور انہیں زخموں کے صدمہ سے فوت ہو گئیں**

"Hicri 58-də Möminlərin anası Hz.Aişə vəfat etdi və Baqi qəbiristanlığında dəfn edildi. O, Mərvanın yanlış əməllərinə qarşı çıxırdı. Bir gün Mərvan yemək bəhanəsiylə onu aldadaraq dəvət etdi və qılınc və xəncərlər yerləşdirilmiş bir çuxura atdı. O, olduqca yaşlı və zəif olduğundan yaralarının səbəb olduğu sarsıntı səbəbindən vəfat etdi". *(Əkbər Şah Nəcibabadi, Tarixil İslam (urdu), cild 2, səh 42, Lahor)*

Mətn olduqca açıqdır. Mətndə Hz.Muaviyyənin adı zikr edilməmişdir, lakin bu mətndə Mərvanın adı keçməkdədir. Həmçinin mətnin isnadı haqqında görəcəyimiz kimi Nəcibabadi səhifənin aşağısında dipnotda "bu yanlışdır və səhih isnadla isbat olunmamışdır" söyləməkdədir.

Həmçinin bilirik ki, Hz.Aişə ölüm yatağındaykən onu ziyarət etməsi onun təbii bir şəkildə əcəliylə ölməsini göstərməkdədir.

حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى، حَدَّثَنَا يَحْيَى، عَنْ عُمَرَ بْنِ سَعِيدِ بْنِ أَبِي حُسَيْنٍ، قَالَ حَدَّثَنِي ابْنُ أَبِي مُلَيْكَةَ، قَالَ اسْتَأْذَنَ ابْنُ عَبَّاسٍ قَبْلَ مَوْتِهَا عَلَى عَائِشَةَ، وَهْىَ مَغْلُوبَةٌ قَالَتْ أَخْشَى أَنْ يُثْنِيَ عَلَىَّ. فَقِيلَ ابْنُ عَمِّ رَسُولِ اللَّهِ ﷺ وَمِنْ وُجُوهِ الْمُسْلِمِينَ. قَالَتِ ائْذَنُوا لَهُ. فَقَالَ كَيْفَ تَجِدِينَكِ قَالَتْ بِخَيْرٍ إِنِ اتَّقَيْتُ. قَالَ فَأَنْتِ

بِخَيْرٍ ـ إِنْ شَاءَ اللَّهُ ـ زَوْجَةُ رَسُولِ اللَّهِ ﷺ وَلَمْ يَنْكِحْ بِكْرًا غَيْرَكِ، وَنَزَلَ عُذْرُكِ مِنَ السَّمَاءِ. وَدَخَلَ ابْنُ الزُّبَيْرِ خِلاَفَهُ فَقَالَتْ دَخَلَ ابْنُ عَبَّاسٍ فَأَثْنَى عَلَىَّ وَوَدِدْتُ أَنِّي كُنْتُ نِسْيًا مَنْسِيًّا.

"..Hz. Aişə (ö. 57/676) ölüm yatağında ikən, İbn Abbas (ö. 68/687) ziyarət üçün icazə istəmiş və Hz. Aişə də ona icazə vermişdi. İbn Abbas; "özünü necə hiss edirsən?" deyə halını sormuş, Aişə (r. anha); "Əgər. Allahdan qorxuramsa (haramlardan qoruna bildiysəm) xeyir üzərə " deyincə, İbn Abbas belə cavab vermişdi: "İnşəallah sən xeyir üzərəsən. Çünki Rasulullahın (s.a.s) xanımısan, o səndən başqasını bakirə olaraq nigahlamadı, üstəlik (ifk hadisəsində) sənin məsum olmanın dəlili səmadan enmişdir." Dedi …
*(Buxari, Nigah, 9, Təfsir Surə, 24/8)*

**Şübhə 12:**

حدثنا أبو معاوية عن الأعمش عن عمرو بن مرة عن سعيد بن سويد قال صلى بنا معاوية الجمعة بالنخيلة في الضحى ثم خطبنا فقال ما قاتلتكم لتصلوا ولا لتصوموا ولا لتحجوا ولا لتزكوا وقد أعرف أنكم تفعلون ذلك ولكن إنما قاتلتكم لأتأمر عليكم وقد أعطاني الله ذلك وأنتم له كارهون

“Səid ibn Suveyd dedi: ”Muaviyyə bizə Nəxilədə duha zamanı (səhər) Cümə namazı qıldırdı. Bundan sonra o, xütbə verdi və dedi: ”Sizinlə namaz qılmanız, oruc tutmanız, Həcc etməniz yaxud zəkat verməniz üçün savaşmadım. Bu vəzifələri yerinə gətirdiyinizi bilirəm. Əksinə, sizin üzərinizdə Əmir olmaq üçün savaşdım və Allah bunu mənə verdi. La-

kin siz istəmirsiniz". *(İbni Əbi Şeybə, cild 6, səh 187, hədis no 30556)*

**Cavab:**

Bu rəvayət mötəbər deyildir və zəifdir. İlk olaraq ravi Aməş müdəllisdir ki, bu hədisin zəif olması üçün yetərlidir. Bundan əlavə digər ravi Səiddə zəifdir. İbn Adi onu zəif saymışdır.
سعيد بن سويد: روى عنه عمرو بن مرة ذكر بن عدي مختصراً وقال البخاري لا يتابع في حديثه انتهى. lisan əl-mizan hansı ki, bu hədisi zəif və etibarsız etməkdədir

**Şübhə 13:**

[ 4514 – قال مسدد ، حدثنا عبد الله ، عن زنيج ، عن أبي موسى ، عن **عبد الله بن أبي سفيان** قال: قال إن عليا قال : إن بني أمية يقاتلونني ، يزعمون أنني قتلت عثمان ، « وكذبوا ، إنما يريدون الملك ، ولو أعلم أنه يذهب ما في قلوبهم أني أحلف لهم عند المقام : والله ما قتلت عثمان ، ولا أمرت بقتله لفعلت ، ولكن إنما يريدون الملك . وإني لأرجو أن أكون أنا وعثمان ممن قال الله عز وجل : ونزعنا ما في صدورهم من غل الآية »].

Rafizilər İbni Həcərdən qısaca dəlil olaraq bu hədisi gətirirlər ki, İmam Əli açıqca bildirmişdir ki, Bəni Umeyyənin təkcə arzusu idarəçi/əmir/xəlifə olmaq idi və o da onların bu niyyətlərinin fərqindəydi.

**Cavab:**

İbn Əl Qəttanın dediyi kimi isnaddakı Abdullah ibn Əbu Sufyan adlı ravi məchuldur (təhzib). Hansı ki, bu hədisi zəif və etibarsız qılmaqdadır. Ayrıca, bu rəvayət digər rəvayətlərlə təzad yaratmaqdadır. Məsələn:

وَكَانَ بَدْءُ أَمْرِنَا أَنَّا الْتَقَيْنَا وَالْقَوْمُ مِنْ أَهْلِ الشَّامِ، وَالظَّاهِرُ أَنَّ رَبَّنَا وَاحِدٌ (1) ، وَنَبِيَّنَا وَاحِدٌ، وَدَعْوَتَنَا فِي الْإِسْلاَمِ وَاحِدَةٌ، لاَ نَسْتَزِيدُهُمْ (2) فِي الْإِيمَانِ باللهِ وَالتَّصْدِيقِ بِرَسُولِهِ، وَلاَ يَسْتَزِيدُونَنَا: الْأَمْرُ وَاحِدٌ، إِلاَّ مَا اخْتَلَفْنَا فِيهِ مِنْ دَمِ عُثْمانَ، وَنَحْنُ مِنْهُ بَرَاءٌ! فَقُلْنَا: تَعَالَوْا نُدَاوِ مَا لاَ يُدْرَكُ الْيَوْمَ بِإِطْفَاءِ النَّائِرَةِ (3) ، وَتَسْكِينِ الْعَامَّةِ، حَتَّى يَشْتَدَّ الْأَمْرُ وَيَسْتَجْمِعَ، فَنَقْوَى عَلَى وَضْعِ الْحَقِّ مَوَاضِعَهُ. فَقَالُوا: بَلْ نُدَاوِيهِ بِالْمُكَابَرَةِ (4) ! فَأَبَوْا حَتَّى جَنَحَتِ (5) الْحَرْبُ وَرَكَدَتْ (6) ، وَوَقَدَتْ (7) نِيرَانُهَا وَحَمِشَتْ (8) . فَلَمَّا ضَرَّسَتْنَا (9) وَإِيَّاهُمْ، وَوَضَعَتْ مَخَالِبَهَا فِينَا وَفِيهِمْ، أَجَابُوا عِنْدَ ذلِكَ إِلَى الَّذِي دَعَوْنَاهُمْ إِلَيْهِ، فَأَجَبْنَاهُمْ إِلَى مَا دَعَوْا، وَسَارَعْنَاهُمْ (10) إِلَى مَا طَلَبُوا، حَتَّى اسْتَبَانَتْ عَلَيْهِمُ الْحُجَّةُ، وَانْقَطَعَتْ مِنْهُمُ الْمَعْذِرَةُ. فَمَنْ تَمَّ عَلَى ذلِكَ مِنْهُمْ فَهُوَ الَّذِي أَنْقَذَهُ اللهُ مِنَ الْهَلَكَةِ، وَمَنْ لَجَّ وَتَمَادَى فَهُوَ الرَّاكِسُ (11) الَّذِي رَانَ (12) اللهُ عَلَى قَلْبِهِ، وَصَارَتْ دَائِرَةُ السَّوْءِ عَلَى رَأْسِهِ

**1.** "İşimizin əvvəlində biz Şam əhli ilə Rəbbimiz bir, Peyğəmbərimiz bir və (camaatın hidayət və nicati istiqamətində) İslamda təbliğ üsulumuz eyni imiş kimi qarşılaşdıq. Biz özümüzü onlardan Allaha, yaxud Onun Peyğəmbərinə qarşı daha imanlı görmürdük. Onlar da həmçinin. İş bərabər və yeksan idi və Osmanın qanı məsələsindən  başqa, aramızda heç bir ixtilaf və fikir ayrılığı yox idi. Biz həmin işdən uzaq və kənar idik."*(Nəhcul Bəlağa, cild.3, s.648; Məktub 58 )*

Həmçinin görürük ki, Hz.Əli Hz.Muaviyyənin ha-

kimiyyət üçün savaşdığını göstərən rafizilərin iddia etdiyi bütün zəif rəvayətləri rədd etmişdir.

قَالَ الجُعْفِيُّ: حَدَّثَنَا يَعْلَى بنُ عُبَيْدٍ، عَنْ أَبِيْهِ، قَالَ:

جَاءَ أَبُو مُسْلِمٍ الخَوْلاَنِيُّ وَأُنَاسٌ إِلَى مُعَاوِيَةَ، وَقَالُوا: أَنْتَ تُنَازِعُ عَلِيّاً، أَمْ أَنْتَ مِثْلُهُ؟

فَقَالَ: لاَ وَاللهِ، إِنِّيْ لأَعْلَمُ أَنَّهُ أَفْضَلُ مِنِّي، وَأَحَقُّ بِالأَمْرِ مِنِّي، وَلَكِنْ أَلَسْتُم تَعْلَمُوْنَ أَنَّ عُثْمَانَ قُتِلَ مَظْلُوْماً، وَأَنَا ابْنُ عَمِّهِ، وَالطَّالِبُ بِدَمِهِ، فَائْتُوْهُ، فَقُوْلُوا لَهُ، فَلْيَدْفَعْ إِلَيَّ قَتَلَةَ عُثْمَانَ، وَأُسْلِمَ لَهُ.

فَأَتَوْا عَلِيّاً، فَكَلَّمُوْهُ، فَلَمْ يَدْفَعْهُم إِلَيْهِ

"Əbu Muslim Xolani və digərləri Muaviyyəyə gedərək ondan soruşdular: "Əliylə mübahisə edir yaxud özünü ona bərabərmi görürsən?
Muaviyyə dedi: " Vallahi, xeyr. Mən onun məndən daha üstün olduğunu və idarəçiliyə haqqı olduğunu bilirəm". Lakin, siz bilmirsinizmi ki, Osman məzlum olaraq öldürüldü? Mən onun xalaoğlusu və qanını axtaranam. Bu səbəbdən, Əliyə get və mənə Osmanın qatillərini göndərməsini söylə (O bunu etdikdən) sonra ona beyət edəcəyəm". Onlar Əliyə getdilər və Onunla danışdılar. Lakin Əli (r.a) Osmanın (r.a) qatillərini təslim etməyi rədd etdi". *(Siyər aləm Ən Nübəla, cild 3, səh 140. Kitabın Mühəqqiqi dedi:*رجاله ثقات *- ricalları siqədir, Həmçinin İmam İbni Kəsir bu rəvayəti Əl Bidayəsində 8/129-da zikr etmişdir)*

Həmçinin bu rəvayət rafizilərin öz kitablarında da

mövcuddur. Şiə tarixçi Nəsr ibn Müzəhhim *"Vaqiət əs Siffin"*-də yazır:

**وإن أبا مسلم الخولانى قدم إلى معاوية في أناس من قراء أهل الشام، ] قبل مسير أمير المؤمنين عليه السلام إلى صفين، [ فقالوا ] له [: يا معاوية علام تقاتل عليا، وليس لك مثل صحبته ولا هجرته ولا قرابته ولا سابقته ؟ قال لهم: ما أقاتل عليا وأنا أدعى أن لى في الإسلام مثل صحبته ولا هجرته ولا قرابته ولا سابقته، ولكن خبروني عنكم، ألستم تعلمون أن عثمان قتل مظلوما ؟ قالوا: بلى.**
**قال: فليدع إلينا قتلته فنقتلهم به، ولا قتال بيننا وبينه.**

"Əbu Muslim Xolani, Əli Siffinə getməmişdən əvvəl şamdan olan bir qrup qura'ayla Muaviyyəyə gəldi. Onlar dedilər: "Nə üçün Əli ilə savaşırsan? Sən səhabəlikdə, hicrətdə, qohumluqda və (İslamı) tez qəbul etməkdə onunla eyni səviyyədə deyilsən. O dedi: " Mən səhabəlikdə, hicrətdə, qohumluqda və (İslamı) tez qəbul etməkdə onunla eyni olduğumu iddia etdiyim üçün savaşmıram. Lakin söyləyin mənə, Osmanın haqqsız olaraq öldürüldüyünün fərqində deyilmisiniz? Onlar dedilər: "Bəli". O dedi: "Əgər o bizə Osmanın qatillərini versə, onları öldürəcəyik və bizimlə onun (Əli) arasında heç bir şey (problem) qalmayacaq".

Ayrıca, maraqlıdır ki, Təbəri bir yazısında Hz.Əlinin (r.a) ölümünə qədər Hz.Muaviyyənin (r.a) xəlifə olaraq görülmədiyini və heç kimin ona beyət etmədiyinə işarə etməkdədir.

**وفى هذه السنة) بويع لمعاوية بالخلافة بايلياء حدثنى بذلك موسى بن عبد ( الرحمن قال حدثنا عثمان بن عبد الرحمن قال أخبرنا اسماعيل بن راشد وكان قبل يدعى بالشأم أميرا وحدثت عن أبى مسهر عن سعيد بن عبد العزيز قال كان على عليه السلام يدعى بالعراق أمير المؤمنين وكان معاوية يدعى بالشأم الامير فلما قتل على عليه السلام دعى معاوية أمير المؤمنين**

"Bu ildə İlyədə Muaviyyəyə beyət edildi. Musa ibni Əbdurrahmən dedi ki, Osman ibni Əbdurrahmən dedi ki, İsmail ibni Raşid bizə dedi: "Muaviyyə Şamın Əmiri kimi çağrılırdı". Əbu Mushir mənə dedi ki, Səid ibni Əbduləziz dedi: "Əli, İraqda Əmirəl Möminin kimi çağrılırdı və Muaviyyədə Şamda Əmir kimi çağırılırdı. Lakin Əli qətl edildiyi zaman, Muaviyyə sonra Əmirəl Möminin kimi çağrılmağa başlandı".

Görüldüyü kimi, İmam Təbəri bu ildən əvvəl heç kimsənin Hz.Muaviyyəni xəlifə olaraq görmədiyini qeyd etməkdədir və İbni Kəsirdə Hz.Əlinin vəfatından sonra ona beyət edildiyini bildirməkdədir.

**Şübhə 14:**

*"Tarixul İslam"* cild 4, səh 94-də İbni Abbas Muaviyyə və Amr ibn As'la danışarkən deyir:

وإن أحق الناس أن لا يتكلم في أمر عثمان لأنتما ، أما أنت يا معاوية فزينت له ما كان يصنع حتى إذا طلب منك نصرك أبطأت عنه وأحببت قتله ، وأما أنت يا عمرو فأضرمت المدينة عليه.

"İbn Abbas dedi.."Osman haqqında danışmağa ən çox haqqı olmayan siz ikinizsiniz. Sən Muaviyyə,

gerçəktən (Osman) səndən yardım istəyənə qədər onun əməllərini ona cazibəli göstərdin. Onu yavaşlatdın (xəyal qırıqlığına uğratdın) və öldürülməsinə sevindin. Və sən Ey Amr, xalqı ona qarşı qızışdırdın ".

**Cavab:**

İbni Əsakir *"Tarixi Diməşq"*də bunu Cuveybir ibn Əsmai yoluyla nəql etmişdir. O, hicri 173-də vəfat etmişdir və bu hadisəyə şahid olmamışdır. Çünki, İbni Abbas hicri 67-də vəfat etmişdir, arada 100 ildən artıq bir boşluq vardır. Rəvayət qopuqdur və zəifdir.

Gerçəkdə, oxuyuruq:

İbni Abbas dedi:

ما رأيت رجلا كان أخلق يعنى للملك من معاوية

"İdarəçilik üçün (4 xəlifədən) sonra Muaviyyədən daha uyğununu görmədim". *(Tarix Diməşq 62/161 Şeyx Zubeyr Əli səhih isnadla Təhqiq, Fədail əs-Səhabə səh 128-də və Məcəllə əl Hədis no: 29 səh 62-də, Musənnəf Abdul Rəzzaq cild 11 səh 453 no: 20985)*

**Şübhə 15:**

Peyğəmbər (sallallahu aleyhi və səlləm) demişdir: ***"Kim Əlini söyərsə, məni söymüş olar. Məni söyən***

***də Allahı söymüş olar. Kim Allahı söyərsə, o üzü aşağı oda atılar".***

**Cavab:**

Bu "hədis" də Peyğəmbərin adından deyilən yalandır. Bu hədis Əhl'i Sünnəyə görə səhih deyildir. Hədisi Hakim *"Müstədrək"*ində (cild 3, səh. 121) qeyd etmişdir. Amma sənədində üç zəif rəvayətçi var:

**1.** ***Əbu İşaq əs-Sueybi:*** Bu rəvayətçi məşhur müdəllisdir. Hədisi "anana" ilə rəvayət etmişdir (hədis elmində, müdəllis rəvayətçi hədisi bu cür rəvayət edərsə, onun bu hədisi qəbul olunmur). Hədisi eşitdiyini açıq bəyan etməmişdir.

**2.** ***Məhəmməd bin Saad əl-Əufi:*** Bu rəvayətçini əl-Xatib və Zəhəbi zəif hesab etmişdir. Dəraqutni isə babat olduğunu demişdir.

**3.** ***Əbu AbduLlah əl-Cadali:*** Bu rəvayətçi etibarlıdır ( siqa). Ancaq radikal rafizidir. Bu hədis isə onun bidətinə kömək üçündür. Hədis alimlərinə görə əgər rəvayətçi bidətinə dəstək üçün rəvayət edərsə, etibarlı olsa belə, hədisi rədd olunur. Əl-Hafiz ibn Həcər demişdir: (Rəvayətçi) bidətinə dəvət edən deyilsə, o bidətçinin rəvayəti qəbul olunur. Amma bidətinə dəstək vermək məqsədi ilə rəvayət edərsə, belə rəvayətləri rədd olunur. *("Nuzhatun-nəzər Şərh nuxbatul-fikar", səh.51)*

**Şübhə 16:**

Aişə (r.a) , Muaviyyə və Amr ibn Asa, qardaşı Muhəmməd ibn Əbu Bəkri öldürdükləri üçün lənət edərdi.

Bu Mətnin ərəbcəsi:
غالبا معترض کا اشارہ اس عبارت کی طرف ہے- البدایہ والنہایۃ 7:349
وقد ذكر ابن جرير وغيره
أن محمد بن أبي بكر نال من معاوية بن خديج هذا ومن عمرو بن العاص ومن معاوية ومن عثمان بن عفان أيضا،
فعند ذلك غضب معاوية بن خديج فقدمه فقتله ثم جعله في جيفة حمار فأحرقه بالنار،
فلما بلغ ذلك عائشة جزعت عليه جزعا شديدا وضمت عياله إليها، وعمرو بن العاص دبر وكان فيهم ابنه القاسم وجعلت تدعو على معاوية الصلوات

**Cavab:**

İmam İbni Kəsir Bunu *"Tarix ət Təbəri"*dən (تاريخ طبرى ج 4 ص77) götürmüşdür, *"Tarix ət Təbəri"*yə baxdığımızda bu rəvayətin Əbu Mixnəf yoluyla gəldiyini görürük ki, Əhl'i Sünnə alimləri onu yalançı hesab etmişlərdir.

İmam əz-Zəhəbi onun haqqında deyir:
**لوط بن يحيى، أبو مخنف، أخباري تالف، لا يوثق به تركه أبو حاتم وغيره. وقال الدارقطني: ضعيف. وقال ابن معين: ليس بثقة. وقال - مرة: ليس بشئ. وقال ابن عدي: شيعي (1) محترق، صاحب أخبارهم**
Lut b. Yəhya, Əbu Mixnəf əl-Əzdi, tövsiq edilməmişdir, Əbu Hatim və digərləri onu tərk etmişdirlər.
Və Dəraqtuni dedi: "zəifdir" və İbni Main dedi: "siqa (güvənilir) deyildir." Başqa bir dəfə isə demişdir: "

Heç bir şey deyil." və İbni Ədi dedi: "Şiə'dir, onların xəbərlərinin sahibidir." *(əz-Zəhəbi, "Mizan əl-Etidal", 3 /419-420, 6992-ci ravi)*

Ayrıca qeyd etmək lazımdır ki, Muhəmməd ibn Əbu Bəkri öldürən Muaviyyə ibn Əbu Sufyan deyil-də, əksinə Muaviyyə ibn Hüdeyc Əs Səkuni əl Kindi-dir.

Muhəmməd ibn Əbu Bəkrin necə öldürüldüyü haqqında ixtilaf edilmişdir. Deyildi ki, o döyüşdə öl-dürülmüşdür yaxud da döyüşdən sonra əsir kimi öl-dürülmüşdür... Muhəmməd ibn Əbu Bəkri öldürən sözügedən vali burada Muaviyyə ibn Hüdeyc Əs Sə-kuni idi. *(Siyər, 3/38)*

**Şübhə 17:**

سمعت أبا عبد الله، وقال له دلويه: سمعت علي بن الجعد يقول: مات والله معاوية على غير الإسلام

İbrahim b. Hani deyir: "Eşitdim ki, Əba Abdullah ( Əhməd b. Hənbəl) dedi: Dellevey dedi: Əli b. Cədin belə dediyini eşitdim: Vallahi Muaviyyə kafir kimi ölmüşdür." *(İmam Əhməd b. Hənbəl "Məsail", səh.408, № 1866 (Rəvayətçi: İshaq b. İbrahim b. Hani ən-Nisaburi))*

**Cavab:**

Əli ibn Cəd Əl Cəvhəri, Əbul Həsən Bağdadi (136-

205 h) Buxarinin ravilərindəndir. Hədisdə siqə və höccət sayılsada məzhəbi pozuqdur, bidət əhli şiə və cəhmi bir kimsə olduğu söylənmişdir.

İmam İbn Həcər əl Əsqəlani (r.a) deyir:

ثقة ثبت رمي بالتشيع

Siqədir, Zəbtdir, Şiəliklə itham edilmişdir. *(Təqrib ət təhzib no 4968)*

İmam Hafiz İbrahim ibn Yaqub Əl Cüzcani dedi:

علي بن الجعد متشبث بغير بدعة, زائغ عن الحق

“Əli ibn Cəd bidətdə israr etdi və haqqdan sapdı”. *(Əhval ər-Rical no 466)*

İmam Muslim dedi:

هو ثقة لكنه جهمي

"O, siqədir lakin cəhmidir." *(Siyər əl-Aləm ən-Nübəla no. 6152)*

Görüldüyü kimi, hədisdə siqə sayılsada bidət əhli bir kimsədir. İbni Həcərində dediyi kimi əgər bidət əhli ravi bidətinə dəvət edən deyilsə, o bidətçinin rəvayəti qəbul olunur. Amma bidətinə dəstək vermək məqsədi ilə rəvayət edərsə, belə rəvayətləri rədd olunur.

Əli ibn Cəd Buxaridə Rasulullahdan (s.a.s) nəql etdiyi hədislərə öz bidətini daxil etməmişdir. Lakin bilmək lazımdır ki, yuxarıda Hz.Muaviyyə ilə bağlı zikr edilən sözlər hədis deyil Əli ibn Cədin öz şəxsi fikirləridir. Onun bidətini dəstəkləyən şəxsi fikirlərinin isə nəzdimizdə dəyəri yoxdur. Əli ibn Cəd təkcə Hz.Muaviyyəyə deyil Hz.Həsənə də dil uzatmışdır.

Məsələn Təhzib əl Kamalda yazılmışdır ki, Əli ibn Cədin yanında Hz.Həsən üçün bu oğlum seyyiddir hədisi oxunduqda, onu kim seyyid etmişdir? deyə uyğunsuz bir etiraz bildirmişdir.

كنت عند عليّ بن الجعد، فذكروا حديث ابن عمر: كنا نُفاضل على عهد رسول الله صلى الله عليه وسلم، فنقول: خيرُ هذه الأمة بعد النبي صلى الله عليه وسلم أبو بكر وعمر وعثمان، فيبلغ النبيَّ صلى الله عليه وسلم، فلا ينكر، فقال عليٌّ: انظروا إلى هذا الصبيّ هو لم يحسن أن يطلق امرأته يقول: كنا نُفاضل.

وقال أيضاً: كنتُ عند عليّ بن الجعد، فذكروا حديث النبي صلى الله عليه وسلم أنه قال للحسن إنّ ابني هذا سيّد. قال: ما جعله سيّداً؟!

وقال أحمد بن إبراهيم الدَّورقيُّ(١): قلت لعلي بن الجعد: بلغني أنك قلت ابن عمر ذاك الصبيُّ، قال: لم أقل، ولكن معاوية ما أكره أن يعذبه الله.

وقال هارون بن سُفيان المستملي(٢): كنتُ عند عليّ بن الجعد، فذكر عثمان بن عفّان، فقال: أخذ من بيت المال مئة ألف درهم بغير حقّ. فقلت: لا والله ما أخذها، ولئن كان أخذها ما أخذها إلا بحقّ. قال: لا، والله ما أخذها إلا بغير حقّ، قال: قلت: لا والله ما أخذها إلا بحق.

وقال أبو عُبيد الآجري(٣): قلت لأبي داود: أيما أعلى عندك: عليّ بن الجعد أو عمرو بن مرزوق؟ قال: عمرو أعلى عندنا، عليّ بن الجعد وُسِمَ بميسم سوء، قال: ما يسوءني أن يُعذّب الله مُعاوية.

(١) تاريخ الخطيب: ١١/٣٦٤.
(٢) نفسه.
(٣) سؤالاته: ٣/٣٨٨.

٣٤٧

Açıqdır ki, Əli İbn Cədin nə Hz.Həsən barəsindəki Yersiz etirazı, nə də Hz.Muaviyyə haqqındakı şəxsi fikirlərinin nəzdimizdə dəyəri yoxdur.

**Şübhə 18:**

İbn Sa'd dedi: Əli ibn Muhəmməd bizə Lut ibn Yəhyadan nəql etdi ki: Bəni Umeyyənin idarəçiləri Ömər ibn Əbdüləzizdən əvvəl minbərlərdə Əliyə lənət edərdilər.

**Cavab:**

"Əli ibn Muhəmməd əl Mədəinidir ki, o zəifdir. Həmçinin onun şeyxi Lut ibn Yəhya da zəifdir. İmam əz-Zəhəbi onun haqqında deyir:
**لوط بن يحيى، أبو مخنف، أخباري تالف، لا يوثق به تركه أبو حاتم وغيره. وقال الدارقطني: ضعيف. وقال ابن معين: ليس بثقة. وقال - مرة: ليس بشئ. وقال ابن عدي: شيعي (1) محترق، صاحب أخبارهم**
Lut b. Yəhya, Əbu Mixnəf əl-Əzdi, tövsiq edilməmişdir, Əbu Hatim və digərləri onu tərk etmişdirlər. Və Dəraqutni dedi: "zəifdir" və ibni Main dedi: "siqa ( güvənilir) deyildir." başqa bir dəfə isə demişdir: "heç bir şey deyil." və ibni Ədi dedi: "şiədir, onların xəbərlərinin sahibidir." *əz-Zəhəbi, "Mizan əl-Etidal", 3/ 419-420, 6992-ci ravi*

**Şübhə 19:**
حدثنا يوسف بن موسى وأبو موسى إسحاق الفروي قالا: حدثنا جرير بن عبد الحميد حدثنا إسماعيل والأعمش عن

الحسن قال: قال رسول الله ﷺ: (إذا رأيتم معاوية على منبري فاقتلوه " ؛ فتركوا أمره فلم يفلحوا ولم ينجحوا.

Bizə Yusif b. Musa və Əbu Musa İshaq əl-Fəravi rəvayət etdilər və dedilər: Bizə Cərir b. Əbdul-Həmid rəvayət etdi, bizə İsmayıl və əl-Aməş rəvayət etdilər ki, Həsən (əl-Bəsri) dedi: Rasulullah (s) dedi: ***"Muaviyyəni mənim minbərimdə görsəniz öldürün".*** (Daha sonra əlavə etdi) Lakin onlar onun əmrini həyata keçirmədilər və bu işi tərk etdilər. *(əl-Bələzuri, Ənsab əl -Əşrəf, c.1, s.121)*

**Cavab:**

İlk öncə qeyd etmək lazımdır ki, *"Ənsabul Əşraf"* yazarının özü üləmanın nəzdində zəif bir kimsədir… Əkrəm Ziya əl Öməri *"əs Sirə"*sində 1/67 uləmanın onu zəif bir mövqedə gördüyünü qeyd etməkdədir. Həmçinin Əl Bələzurinin özü səhih bir sənədlə Həsən əl Bəsrinin Muaviyyəyə beyət etdiyini bildirməkdədir. Bilmək lazımdır ki, Həsən əl Bəsri bunu mürsəl bir şəkildə Rasulullahdan (s.a.s) zikr etmişdir ki, Həsən əl Bəsrinin mürsəlləri olduqca zəifdir. Hətta Əhməd ibn Hənbəl rahiməhullah mürsəllər içərisində Ata ibn Əbu Rəbah və Həsən əl Bəsrinkindən daha zəifi yoxdur buyurmaqdadır. *"Əl Fəvaid Əl Məcmua"* 1/323 yazarı Uqeylidən bu yöndə gələn hədisi zikr etdikdən sonra deyir:
**لا يصح في هذا المتن شيء** (Bu mətn üçün səhih isnad yox-

dur)

Həmçinin  bu ifadə məntiqdəndə yanlışdır. Əshabın Rasulullahın (s.a.s) əmrinə itaətsizlik etdiyi necə düşünüləbilər. Nə üçün Hz.Əli Hz.Muaviyyə ilə qarşılaşdıqda Rasulullahın (s.a.s) bu əmrini onun tərəfində olan insanlara anlatmamışdır? Bu hədis hər yönüylə rədd edilər.

**Bu hədisin keçdiyi digər qaynaqlar və onların isnadları belədir:**

**Birinci isnad:**

Buna bənzər bir hədisi İbnʿAdī *"əl-Kāmil"* (2/146), ( 5/200), (5/314) İbnul Cəzvi *"əl-Məvzuʿāt"* (2/265), " onu daşlayın," sözüylə  və  İbni Əsakir *"Tārīx Diməşq "*ində (59/155) zikr etmişdir ki, hamısının isnadı Mücəllid ibn Səʿīd Əbū əl-Vədəkdən, o da Əbu Səid əl-Xudridən şəklindədir.

**Cavab:**

Mücəllid ibn Səid əl Kufi zəif bir kimsədir. Alimlərin onun haqqında görüşü belədir.

Buxari dedi "Yəḥya əl-Qəṭṭān onu zəif saymışdır və İbnul Mehdi ondan rəvayətlər edərdi."

Əl Cüzcani dedi: "Onun rəvayətləri zəifdir."

*(Əhval ər rical, ravi no 126)*

Yəhya ibn Main dedi: “O zəifdir.”

Ən-Nəsai dedi: “Kufəlidir, zəifdir.”
*(Əz Zuafa vəl Matrukin, ravi no 556)*

**İkinci isnad:**

Bu rəvayəti eynilə İbn ʿAdī *"Əl-Kāmil"* (7/83), Bəlazuri *"Ənsab əs-Əşraf"* (5/136), İbnul Cəvzi *"Məvzuʿāt "* (2/256), və İbn ʿƏsakir *"Tārīx Diməşq"*ində ( 59 /55) zikr etmişdir. Bunların hamısı Əli ibn Zeyd ibn Cudanın Əbu Nəzrədən, o da Əbu Səid Əl Xudridən rəvayət etmişdir şəklindədir.

**Cavab:**

Buradakı ravi Əli ibn Zeyd ibn Cudan zəifdir. Alimlərin onun haqqında görüşü belədir

İmam Əhməd dedi, o heç bir şeydir.

Yəhya ibn Main dedi ki, güclü deyildir…
*(Tarix ibn Məin, 4/131)*

Əl Cüzcani onun haqqında dedi: "Diqqətsizdir, zəifdir və etibar edilməz”. *(Əhval ər rical ravi no 185)*

Nəsai və İbn Uyeynə onu zəif saymışlardır. *(Ət təh-*

*zib, cild 3, səh 126)*

İbn Adi dedi: "Şiəlikdə aşırıdır, zəifliyinə baxmayaraq hədisləri yazılar". *(Əl Kamil, cild 5, səh 201)*

İbn Xuzeymə dedi: "Onu hafizəsinin zəif olması hesabına etibarlı görmürəm".

**Üçüncü isnad:**

Həmçinin İbn ʿAdī *"əl-Kāmil"* (2/209), İbn Hibban *"əl Məcruhin"* (1/35), İbnul Cəvzi *"əl Məvzuat"* (2/265 )-ında zikr etmişdir ki, bunların hamısı ʿAbbād ibn Yaʿqūb əl-Rəvacini - əl-Hakəm ibn Ẓahīr - o ʿĀṣimdən - o Zirrdən - o İbn Məsʿūddan - o da Rasulullahdan (s.a.s) rəvayət etmişdir şəklindədir.

**Cavab:**

İsnaddakı Əl Hakəm ibn Zahir əl Fəzari əl Kufi zəif bir kimsədir. Uləmanın onun haqqında görüşü belədir.

Buxari dedi: "Onun rəvayətləri münkərdir".

Ən Nəsai dedi: "Onun rəvayətləri tərke dilmişdir, Kufəlidir". *(Əz Zuafa vəl Mətrukin, ravi no 127)*

Yəhya ibn Məin dedi ki, o bir şey deyildir.

İbn Hibban *"əl Məcruhin"*də onun haqqında deyir: "Kufəlilər ondan rəvayət edər. Hz.Muhəmmədin ( s. a.s) Əshabına dil uzadar və etibarlı ravilərdən uydurma şeylər nəql edərdi. Və o Asimdən o da Zirdən … (nəql etmişdir) rəvayəti tam olaraq nəq ledir". *(Əl Məcruhin, cild 1, səh 304)*

Ümumiyyətlə bu barədə keçən hədislərin hamısı zəifdir.

**Şübhə 20:**

قال أبو مخنف عن الصقعب بن زهير عن الحسن قال أربع خصال كن في معاوية لو لم يكن فيه منهن إلا واحدة لكانت موبقة انتزاؤه على هذه الأمة بالسفهاء حتى ابتزها أمرها بغير مشورة منهم وفيهم بقايا الصحابة وذوو الفضيلة واستخلافه ابنه بعده سكيرا خميرا يلبس الحرير ويضرب بالطنابير وادعاؤه زيادا وقد قال رسول الله ﷺ الولد للفراش وللعاهر الحجر وقتله حجرا ويلا له من حجر وأصحاب حجر مرتين

Həsən Bəsri deyib: Muaviyyədə dörd xislət var idi ki , əgər onlardan biri belə onda olsaydı onun Qiyamət günündə həlak olmasına kifayət edərdi.

Birinci: Muaviyə xilafəti qılınc və qan gücünə ələ keçirtdi. Səhabələrdən bir dəstə hələ dünyada var ikən onlarla şuraya oturub məşvərət etmədi.

İkinci: - İpək paltarlar geyib əyyaşlıga və araq içməklə gününü keçirən oğlunu xəlifə təyin etdi.

Üçüncü: - Peygəmbərin (s) buyurduğunu (halalzadə

doğulduğu yataq sahibinə məxsusdur və vəlәduzinanın yeri daşlıqdır) əksinə gedərək Ziyadı özünə qardaş elan etdi.

Dördüncü: - Muaviyyənin əmri ilə Hicr ibn Ədini və altı nəfər səhabələri ilə diri halda basdırıb öldürdülər. Vay olsun Muaviyəyə Hicri öldürdüyünə görə , vay olsun Muaviyyəyə Hicri öldürdüyünə görə, vay olsun Muaviyəyə Hicri öldürdüyünə görə.
*(Tarix Təbəri, 51-ci ilin hadisələri. 4/208, əl-Kamil fit Tarix 51-ci ilin hadisələri 3/487)*

**Cavab:**

Təbəri bunu *"Tarix"*ində, İbnul Cəzvinində *"Əl Muntəzəm"*ində sitat gətirdiyi kimi Əbu Mixnəf Lut ibn Yəhya yoluyla zikr etmişdir ki, o şiə və zəif bir kimsədir.

İmam əz-Zəhəbi onun haqqında deyir:
**لوط بن يحيى، أبو مخنف، أخباري تالف، لا يوثق به تركه أبو حاتم وغيره. وقال الدارقطني: ضعيف. وقال ابن معين: ليس بثقة. وقال - مرة: ليس بشئ. وقال ابن عدي: شيعي (1) محترق، صاحب أخبارهم**
Lut b. Yəhya, Əbu Mixnəf əl-Əzdi, tövsiq edilməmişdir, Əbu Hatim və digərləri onu tərk etmişdirlər. Və Dəraqutni dedi: "zəifdir" və ibni Main dedi: "siqa ( güvənilir) deyildir."
Başqa bir dəfə isə demişdir: "Heç bir şey deyil." və ibni Ədi dedi: "Şiədir, onların xəbərlərinin sahibidir."
*(əz-Zəhəbi, "Mizan əl-Etidal", 3/419-420, 6992-ci ravi)*

İbni Əsir bunu *"Əl Kamil"*ində bunu sənədsiz şəkildə nəql etmişdir ki, sənədsiz gələn rəvayət məqbul deyildir. İbni Kəsir isə *"Tarix"*ində (8/140)-da bunu "və Həsən Əl Bəsridən rəvayət edildi ki" şəklində zikr etməkdədir ki, bu da rəvayəti etibarsız qılmaqdadır.

**Şübhə 21:**

**1.** Muaviyyə Səsə ibn Suhana dedi: Minbərə çıx və Əlini lənətlə! Səsəə imtina edib dedi: Məni əfv et! Muaviyyə israr etdi ki, yox gərək lənətləyəsən! Səsəə naçar qalıb minbərə qalxdı və dedi: Ey camaat Muaviyyə mənə əmr edir ki, Əlini lənətləyim. Camaat siz də onu lənətləyin. Allah ona lənət etsin! *(əl-Əqdul-fərid, yalan və küfrdən tovriyə babı 2/266)*

**2.** Muaviyyə Əhnəfə dedi: Səni and verirəm Allaha! Çıx minbərə və Əlini lənətlə. Əhnəf dedi: Bu işi görməkdən məni əfv etməyin və məndən əl çəkməyin sənin xeyrinədir. *(əl-Əqdul-fərid, bab mücavibətul umara vərrədu ələyhim 4/98)*

**3.** Muaviyyə Aqil ibn Əbu Talibə dedi: Əli səninlə əlaqəni kəsdi, lakin mən səninlə əlaqəyə can atdım. Sən məni ancaq bir vasitəylə, yalnız Əlini lənətləməklə razı salarsan. Əqil dedi: Muaviyyə sənin dediyini edərəm və minbərə qalxdı. Əqil Allaha həmd və səna edəndən sonra dedi: Ey camaat, əmirulmuminin Muaviyyə mənə əmr edib ki, Əli ibn Əbu Talibi

lənətləyim, camaat onu lənətləyin. Camaat Allahın və bütün insanların lənəti olsun ona. *(əl-Əqdul-fərid, bab mücavibətul uməra vərrədu ələyhim 4/98)*

**Cavab:**

Bu 3 rəvayətində isnadı yoxdur. Üstəlik *"əl-İqd əl-Fərid"* kitabı rəvayət, təhqiq, tarix kitabı deyil, ədəbiyyat kitabıdır. Həmçinin kitabın yazarı İbn Əbdi Rəbbih şiə'dir və iqd əl fərid Əhl'i Sünnə kitabı olaraq qəbul edilməməkdədir.

Əhməd bin Muhamməd bin Abdi Rabbih bin Həbib bin Hudeyr bin Səlim, Əbu Ömər əl-Qurtubi, məşhur *"əl-İqdul-Fərid"* kitabının sahibidir. Hicri 246-cı ildə Qurtuba şəhərində doğulub və orada böyüyüb. Hişam bin Abdir-Rahmən bin Muaviyyə bin Hişam bin Abdil-Məlik bin Mərvan bin əl-Həkəm əl-Əməvi'nin azadlı qulu olub. əl-Hafiz İbn Kəsir - rahiməhullah - onun haqqında və kitabı haqqında deyir: "Çox əsər yazmış fəzilət sahiblərindən, insanların tarixini bilən alimlərdən biri idi və onun *"əl-İqd"* kitabı üstün xüsusiyyətlərin bolluğundan və əhəmiyyətli elmlərin çoxluğundan xəbər verir. Lakin onun sözlərinin çoxu onun şiəliyinə və əməviləri açlaltmaq meylinə dəlalət edir. Bu isə onun kimi birindən çox təəccüblüdür, çünki o, (əməvilərin) azad etdikləri qullardan biridir. Onlara düşmən kəsilənlərdən deyil də onları sevənlərdən olması daha uyğun olardı."

*("əl-Bidayə van-Nihayə", 15/120-121; Dar Hicr, Misir, birinci nəşr; 1419/1998)*

Yenə İbn Kəsir *"Tarix"* kitabında Xalid bin Abdil-ləh haqqında rəvayət edilmiş, zahiri küfr olan sözləri nəql etdikdən sonra deyir: "Ola bilsin ki, onun bu sözləri söyləməsi səhih deyildir. *"əl-İqd"* sahibinin onu söydüyünü və (bu sözləri dediyini) onun haqqında təsdiqlədiyini gördüm; çünki *"əl-İqd"* kitabının sahibində iyrənc şəkildə şiəlik var…
Ola bilsin ki, hər kəs onu başa düşmür və şeyximiz əz-Zəhəbi ona aldanmış və onu hafizəsinə və başqa xüsusiyyətlərinə görə mədh etmişdir. Onun şiəliyini başa düşməyib. Doğrusunu Allah bilir!"
*(əl-Bidayə van-Nihayə, 13/202-203; Dar Hicr, Misir, birinci nəşr; 1419/1998]*

**<u>Şübhə_22:</u>**

**حَدَّثَنِي إِبْرَاهِيمُ بْنُ مُوسَى، أَخْبَرَنَا هِشَامٌ، عَنْ مَعْمَرٍ، عَنِ الزُّهْرِيِّ، عَنْ سَالِمٍ، عَنِ ابْنِ عُمَرَ، قَالَ وَأَخْبَرَنِي ابْنُ طَاوُسٍ، عَنْ عِكْرِمَةَ بْنِ خَالِدٍ، عَنِ ابْنِ عُمَرَ، قَالَ دَخَلْتُ عَلَى حَفْصَةَ وَنَسْوَاتُهَا تَنْطُفُ، قُلْتُ قَدْ كَانَ مِنْ أَمْرِ النَّاسِ مَا تَرَيْنَ، فَلَمْ يُجْعَلْ لِي مِنَ الأَمْرِ شَىْءٌ. فَقَالَتِ الْحَقْ فَإِنَّهُمْ يَنْتَظِرُونَكَ، وَأَخْشَى أَنْ يَكُونَ فِي احْتِبَاسِكَ عَنْهُمْ فُرْقَةٌ. فَلَمْ تَدَعْهُ حَتَّى ذَهَبَ، فَلَمَّا تَفَرَّقَ النَّاسُ خَطَبَ مُعَاوِيَةُ قَالَ مَنْ كَانَ يُرِيدُ أَنْ يَتَكَلَّمَ فِي هَذَا الأَمْرِ فَلْيُطْلِعْ لَنَا قَرْنَهُ، فَلَنَحْنُ أَحَقُّ بِهِ مِنْهُ وَمِنْ أَبِيهِ. قَالَ حَبِيبُ بْنُ مَسْلَمَةَ**

**فَهَلاَّ أَجَبْتَهُ قَالَ عَبْدُ اللَّهِ فَحَلَلْتُ حُبْوَتِي وَهَمَمْتُ أَنْ أَقُولَ أَحَقُّ بِهَذَا الأَمْرِ**

مِنْكَ مَنْ قَاتَلَكَ وَأَبَاكَ عَلَى الإِسْلاَمِ. فَخَشِيتُ أَنْ أَقُولَ كَلِمَةً تُفَرِّقُ بَيْنَ الْجَمْعِ، وَتَسْفِكُ الدَّمَ، وَيُحْمَلُ عَنِّي غَيْرُ ذَلِكَ، فَذَكَرْتُ مَا أَعَدَّ اللَّهُ فِي الْجِنَانِ. قَالَ حَبِيبٌ حُفِظْتَ وَعُصِمْتَ. قَالَ مَحْمُودٌ عَنْ عَبْدِ الرَّزَّاقِ وَنَوْسَاتُهَا.

Mənə İbrahim bin Musa rəvayət etdi (və dedi), Hişam mənə Muamərdən, o da əz-Zuhridən, o da Salimdən, o da İbn Ömərdən; (ikinci sənəd) İbn Tavus mənə İkrimə bin Xaliddən, o da İbn Ömərdən xəbər verdi və belə dediyini söylədi: Həfsəni ziyarət üçün yanına gəldim. Bu əsnada (təzəcə yuyunduğu üçün) hörüklərindən su damlayırdı. Dedim: “İnsanların vəziyyəti gördüyün kimidir. Ancaq mənim üçün heç bir əmirlik verilməmişdir.” Həfsə dedi: “Onların yanına get, çünki onlar səni gözləyirlər. Sənin orada iştirak etməməyinin onlar arasında ixtilafa səbəb ola biləcəyindən qorxuram.” Beləliklə, biz onların yanına getməyənə qədər Həfsə ibn Ömərdən əl çəkmədi. İnsanlar arasında təfriqə düşən zaman Muaviyyə kütləyə müraciət etdi: “Əgər bu xəlifəlik məsələsi barədə söz demək istəyən varsa, üzə çıxsın, gizlənməsin. Şübhəsiz ki, biz xəlifə olmağa ondan da, atasından da daha layiqik.” Bu zaman Həbib bin Məsləmə (İbn Ömərə) dedi: “Bəs nə üçün ona cavab vermədin ?” Adbullah bin Ömər dedi: Mən paltarımın arxama və ayaqlarıma dolaşan bağını açıb: “İslam uğrunda sənə və sənin atana qarşı vuruşan şəxs xəlifəliyə daha layiqdir” - demək istədim. Lakin sözlərimin insanlar arasında təfriqə yaradacağından, bununla da

qan tökülməsinə səbəb olacağından və nəzərdə tutduğum mənada başa düşülməyəcəyindən qorxdum. O anda Allahın Cənnət bağlarında (səbr edənlər və axirət həyatını dünya həyatından üstün tutanlar üçün) hazırladığı mükafatı xatırladım (və susdum)… Həbib dedi: "Sən özünü qorudun və təhlükəyə atmadın (ağıllı hərəkət etdin)." ***(Muhəmməd bin İsmayıl əl-Buxari, əl-Cami əs-səhih, Kitab əl-Məğazi, c.5, s.110, h. 4108; Dar Tauq ən-Nəcə, Beyrut, 1422/2001; təhqiq: Muhəmməd Zuheyr bin Nasir ən-Nasir)***

**Cavab:**

Görüş nə zaman baş vermişdir?

Hz.Muaviyyə ilə İbn Ömərin bu görüşünün zamanı haqqında üləmanın üç görüşü vardır. Birinci görüş odur ki, bu Hz.Muaviyyənin Hz.Həsənlə görüşü zamanı baş vermişdir (necə ki, İmam Heysəmi bunu *"Məcməuz Zəvaid"*də cild 4, səh 242-də qeyd edir)
Lakin İmam İbn Həcər bunun yanlış bir iddia olduğunu konkret dəlillərlə izah etməkdədir. *(Fəthul Bari, cild 7 səh 403)*. Digər bir qismi isə dedi ki, bu Yezidə beyət zamanı baş vermişdir ki, bunu *"İbnul Cəzvi, Kəşfil Müşkil"*də cild 2,səh 576-da qeyd edir ki, İmam İbn Həcər bunu mümkün olamayacağını qeyd etməkdədir. *(Fəthul Bari cild 4, səh 703)* Üçüncü qisim uləma isə Bunun Hz.Muaviyyə ilə Hz.Əli arasında baş verən görüş zamanı olduğunu söyləməkdədir ki,

bu doğru görüş kimi görünməkdədir və İbn Həcərdə bu görüşdədir. Həmçinin Əbdurrazzəqın *"Musənnəf"*ində gələn bir hədisdə bu görüşün bu zaman baş verdiyini göstərməkdədir . *(cild 5, səh 483, no 9779)*

**<u>Hz.Muaviyyə kimi nəzərdə tutaraq bu sözləri demişdir?</u>**

Uləmadan bəziləri Muaviyyənin qəsd etdiyinin Həsən və atası olduğu söylərkən bir qismi də İbni Ömər və atasını qəsd etdiyini söyləməkdədir. Bununla birlikdə bu görüşlərin hər ikisi də orjinallıq işığında dəlildən daha çox şərhdir və bu səbəblə qətiyyət təşkil edəməzlər. Dahası, Hz.Muaviyyə Hz. Həsən və İbn Ömərlə arasında hər hansı bir münaqişə yox idi. Necə ki, Hz.Muaviyyənin özü demişdir:

وقد ذكر يحيى بن سليمان الجعفي أحد شيوخ البخاري في " كتاب صفين " في تأليفه بسند جيد عن أبي مسلم الخولاني أنه قال لمعاوية : أنت تنازع عليا في الخلافة أو أنت مثله ؟ قال : لا ، وإني لأعلم أنه أفضل مني وأحق بالأمر ، ولكن ألستم تعلمون أن عثمان قتل مظلوما وأنا ابن عمه ووليه أطلب بدمه ؟ فأتوا عليا فقولوا له يدفع لنا قتلة عثمان ، فأتوه فكلموه فقال : يدخل في البيعة ويحاكمهم إلي ،

"İmam Buxarinin müəllimlərindən olan Yəhya ibni Süleyman Əl Cafi *"Kitab əs Siffin"* kitabında güclü isnad ilə Əbu Muslim Əl Xolanidən nəql etdi ki, O Muaviyyədən soruşdu: "Sən, Əliylə xilafət barəsində mübahisə edir yaxud özünü ona bərabərmi görürsən ?" o dedi: "Vallahi, xeyr. Mən onun məndən daha üstün olduğunu və idarəçiliyə haqqı olduğunu bilir-

əm”. Lakin, siz bilmirsinizmi ki, Osman məzlum olaraq öldürüldü? Mən onun xalaoğlusu və qanını axtaranam. Bu səbəbdən, Əliyə get və mənə Osmanın qatillərini göndərməsini söylə, (O bunu etdikdən) sonra ona beyət edəcəyəm. Onlar, Əliyə getdilər və onunla danışdılar, Əli (r.a) dedi: ”İlk öncə mənə beyət et və sonra bu barədə soruş”. *(Fəth əl Bari (13/ 92))*

Görüldüyü kimi, burada Hz.Həsənin qəsd edilməsi mümkün deyildir, çünki Hz.Muaviyyə Hz.Əlinin xilafətə ondan daha layiq olduğunu iqrar etməkdədir. Hz.Həsəni nəzərdə tutaraq bu sözləri sərf etməsi düşünüləməz.

*"Musənnəf"*də (cild 5, səh 465)-də burada Muaviyyənin ibn Öməri qəsd etdiyini söyləməkdədir, lakin bu hər hansı səhabənin fikri deyildə isnaddakı bir ravinin görüşüdür ki, bu yenə də mütləq dəlil olaraq istifadə edilə bilməz. Həmçinin Hz.Muaviyyə demişdir:

عن ثابت مولى سفيان قال سمعت معاوية وهو يقول إني لست بخيركم وإن فيكم من هو خير مني عبد الله بن عمر وعبد الله بن عمرو وغيرهما من الأفاضل ولكني عسيت أن أكون أنكاكم في عدوكم وأنعمكم

“Mən sizdən daha xeyirli deyiləm və sizin aranızda Abdullah ibn Ömər, Abdullah ibn Amr və digər fəzilətli kimsələr vardır. Lakin düşmənlərinizi öldürməkdə mən daha üstünəm”.

*(İbn Əsakir, Tarixi Di-məşq, cild 59, səh 163)*

Həmçinin İbn Həcər rahiməhullah deyir:

وقيل أراد عمر وعرض بابنه عبد الله وفيه بعد لأن معاوية كان يبالغ في تعظيم عمر

"Və Muaviyyənin ibn Öməri və Ömər ibn Xəttabı nəzərdə tutduğu söylənmişdir. Lakin bu (həqiqətdən ) uzaqdır, çünki məhşurdur ki, Muaviyyə Ömərə çox sayğı duyardı"

Bəziləri deyə bilər ki, İbn Ömər xəlifə olmaq arzusunda idi və bu səbəbdən Hz.Muaviyyə onu nəzərdə tutaraq bu sözləri demişdir.
Lakin bu da doğru görünməməkdədir. Çünki, hədisə baxıldıqda İbn Ömərin özü belə deməkdədir.

فَلَمْ يُجْعَلْ لِي مِنَ الأَمْرِ شَيْءٌ - "Ancaq mənim üçün heç bir əmirlik verilməmişdir". İfadədə də görüləcəyi üzərə Hz.Həfsa anamızın zorlamasından sonra xilafət iddiası üçün deyildə insanların ixtilafa düşməməsi üçün İbn Ömər oraya getmişdir. Həmçinin İbn Ömərin xəlifə olmağı istəmədiyinə dair digər rəvayətlərdə vardır ki, onlar belədir:

Fitnə azğınlaşan zaman insanlar İbni Ömərə (r.a) gəl-gəldilər və dedilər:
"أنت سيد الناس وابن سيدهم ، والناس بك راضون ، اخرج نبايعك . فقال

:" لا والله لا يهراق في محجمة من دم ولا في سببي ما كان في روح

"Onlar ona gəldilər və dedilər "Sən insanların əfəndisi və onların əfəndisinin oğlusan, və insanlar səndən razıdırlar, çölə çıxda sənə beyət edəlim. O dedi : "Xeyr, vallahi, Ruhum olduğu müddətcə hətta bir bardaq qan belə mənim səbəbimdən tökülməyəcək."
*(Qaynaq 1: "Əbu Naim, Həyatul Əvliyya")*
*(Qaynaq 2: "Təzkərətül Huffaz (cilt 1,səh 32), İmam Zəhəbi")*
http://lib.eshia.ir/40326/1/32

Görüldüyü kimi İbni Ömər xəlifəlik istəyində olmamışdır ki, Hz.Muaviyyənin onu və atasını nəzərdə tutaraq bu sözləri sərf etmiş olsun. Gerçəkdə Hz. Muaviyyənin bunu hər hansı xüsusi bir şəxsi nəzərdə tutaraq söyləməmişdir sadəcə ümumi bir ifadə işlətmişdir ki, buda ərəblərdə ifadəni vurğulamaq üçün bolca işlədilən ümumi bir ifadədir. Məsələn, فلان افضل منک ومن ابيک-"Falan səndən və atandan daha fəzilətlidir". Burada söylənilən ifadəyə vurğu edilmək üçün deyildiyi bilinir, yoxsa kiminsə atasına hücum niyyətində olduğu söylənəməz. Buna misal olaraq, İbn Abbasla İbn Zubeyr arasında baş verən fiqhi mübahisəni misal gətirmək olar. İbni Zubeyr İbn Abbasın fətvasını yanlış görərək onun fəqih olmadığını söylədiyində İbni Abbas belə demişdir:

“فقال ابن عباس: والله لأنا أفقه منك ومن أبيك”، - “Mən səndən və atandan daha böyük fəqihəm”. *(Bəlazuri, Ənsb Əl Əşraf, cild 1, səh 463).* Burada İbn Abbasın Əşarəyi Mübəşşərədən olan Zubeyri ibn Avvamı küçümsədiyi düşünüləməz , lakin əksinə “Sənin atandan daha böyük” ifadəsi ərəb üslubunda mübaliğə və əlaqə jestidir.
İbn Ömərin onun ifadəsini insanların yanlış şərh etməsindən qorxduğu üçün səssiz qalmasını və eyni şəkildə bu gün insanların eyni şeyin qurbanı olduğunu, İbn Ömərin bu barədə çəkindiyi şeyin gerçəkləşdiyini görmək necə də kədərlidir.

Yəni nəticə olaraq Hz.Muaviyyə bu sözləri Nə Hz. Həsəni nə də İbn Öməri nəzərdə tutaraq sərf etməmiş, sadəcə söylədiyi ifadəni vurğulamaq üçün ümumi bir şəkildə işlətmişdir.

**Şübhə 23:**

“Hz. Muaviyyənin son arzusu ölmədən öncə isti bir gündə şərab içib övladlarını seyr etməkdi”. *(Müsnədi Əhməd c.5. s.347 və Tarixi İbn Asakir c.7 s.311)*

**Cavab:**

Sualda Əhməd bin Hənbəlin *“Müsnəd”*i və *“Tarihi İbn Asakir”* qaynaq verilərək onun son arzusunun bu olduğu iddia edilir. Məsələnin əsli və həqiqəti budur ki: Əhməd bin Hənbəl adı çəkilən kitabında səhabə-

dən Bureydə əl-Əsləmidən hədislər nəql edərkən belə bir hədis nəql edir: "(Bureydənin oğlu) Abdullah bin Bureydə belə dedi: "Mən və atam (Bureydə) Muaviyyənin yanına daxil olduq, o bizi bir döşək (firaş) üzərində oturtdu, bizə yemək gətirildi, birlikdə yedik, daha sonra şərab (ütiynə bi`ş şarabi) gətirildi. Muaviyyə içdi, sonra atam (Bureydə) da içdi. Sonra o (Hz. Muaviyyə) belə dedi: "Mən onu Rasulullah (sallallahu əleyhi və əlihi və səlləm) haram qıldığından bəri içmədim". Daha sonra o (Muaviyyə) belə dedi: " Mən Qureyşin ən gözəl/yaraşıqlı, ən yaxşı, comərd və gözəl danışan, onu (hamr`ı=şərabı) tapdığım kimi, onun ləzzətini tapan bir gənc idim".
Bu hədisdən nəqlən Hz. Muaviyyənin şərab içdiyi iddia edilməkdədir. Bu iddiaya bir neçə maddə ilə cavab vermək olar:
**1.** Hadisə Hz. Muaviyyənin xəlifəlik illərində Şamda baş vermişdir. Bureydə əl-Əsləmi və oğlu Abdullah onu ziyarət ediblər, yemək yeyib şərab (məşrubat) içmişdilər. Burada şərab məşrubat və içəcək anlamındadır. Çünki Ərəbcə`də şərab haram və halal bütün içəcək və məşrubatların adıdır. Bunu hardan bilirik?

Hədis kitablarına baxınca, *"Kitabul-Əşribə= Şərablar (İçəcəklər) Kitabı"* adlı bölümlərə rast gəlirik. *"Kitabul-Əşribə"*lərdə Hamr (Şərab), Nəbiz (Şirə), süd, xurma suyu, su və sıxılmış meyvə sularından bəhs edilir.

Bunlardan sərxoşluq verən və günümüzdə "şərab" deyə anlaşılan "hamr" haram qılındısa, digərləri haldır. Məlum olduğu kimi bizim şərab olaraq adlandırdığımız sərxoş edicinin özəl adı "HAMR"dır.

Hz. Muaviyyə Bureydə və oğluna öncə yemək yedirtmiş, sonra şərab/məşrubat (içəcək) ikram etmişdir. Əgər ikram edilən şey "HAMR" olsaydı, mətndə "ütiynə bi`ş-şərabi=bizə şərab/məşrubat gətirildi" deyil, "ütiynə bi`l-hamri=bizə hamr (sərxoş edən şərab) gətirildi" deyilərdi. Qur'anda da sərxoş edən şərab "HAMR" olaraq anılır və hədislərdə də bu belədir.

**2.** Gətirilən içəcək və məşrubatdan, Bureydə və Hz. Muaviyyə yeməkdən sonra içmişdir. Bureydənin oğlu Abdullah isə özünün içib içmədiyindən söz etməməkdədir. Amma görünür ki cahil biri bunun şərab kəliməsinə baxaraq, mövzunun əslini bilmədən və ya pis niyyətlə həm Hz.Muaviyyəyə, həm də əshabı kiramdan Bureydəyə (r.a) heç ağıla gəlməyən iftira atmaqdadır.

**3.** Bu hadisəni tərəfsiz dəyərləndirən bir elm adamı, burada bəhs edilən "şərabın=məşrubatın", "HAMR" =sərxoş edən şərab olduğuna hökm edə bilməz, bu bir iftira, səhabəyə palçıq atmaq, səb etmək, onlara qarşı haqsızlıqdır.

**4.** Diqqət edilirsə, məşrubat içilərkən Hz.Muaviyyə haram edildiyindən bəri ağzına sərxoş edən məşrubat almadığını da söyləməkdədir. Hicrətin 4-cü ilində bütün sərxoşluq verən şərablar (məşrubatlar və içəcəklər) haram qılınmışdı. Bunlar içində Məkkə və Mədinədə bilinən və içilən xurma koruğu (büsr) və quru xurmadan (təmr) istehsal olunan içkilər, Yəmənlilərin baldan istehsal etdikləri biti və arpa və darıdan emal edilən "ğubeyra" adlı içkiləri də vardı.

**5.** Qur'ani Kərimdə şərab (içəcək, məşrubat) kəliməsi bir neçə ayətdə keçir. Məsələn: Ənam surəsi 70-ci və Yunus surəsi 4-cü ayətlərinə görə Cəhənnəmliklər üçün "şərabün min həmim=qaynar sudan bir məşrubat içəcək" ayəti vardır. Diqqət edilərsə bu içəcək sərxoş edən bir müskir olmadığı halda şərab deyə adlandırılmışdır. Ayrıca Nəhl surəsi 69-cu ayətinə görə "onların (bal arılarının) qarınlarından rəngləri çeşidli bir şərab (bal) çıxar.
Göründüyü kimi ayətdə özündən məşrubat istehsal edilən və maye olan, ancaq halallığında şübhə olmayan bala da şərab deyilir.

Kəhf surəsi 29-cu ayəti cəhənnəmliklərə verilən və əri-miş mədən kimi üzləri qaynayan suyu da, sərxoş ed-ici özəlliyi olmamasına baxmayaraq "bi`sə`ş-şərəb = nə pis içəcək" olaraq anır.

Sad surəsi 42 ci ayətdə Hz.Əyyub (aleyhissəlam)`a "ürkuz bi riclikə, haza muğtəsəbun baridun və şərəb =ayağını yerə vur, bu yuyunacaq sərin bir su və şərab (içəcək)" deyə əmr və müjdə verilir.
Deməli su da ərəbcədə şərab/məşrubat deyə adlandırılır.

Yenə Sad surəsinin 51-ci ayətində "Onlar qoltuqlara yaslanıb qurularaq bir çox meyvələr və şərablar (məşrubatlar və şərbətlər) içərlər" deyə anlatılmaqdadır.

İnsan surəsi də cənnətliklərdən söz edərkən 21ci ayətində onları " (Cənnət əhlinin) əyinlərində taftadan və atlazdan (nazik və qalın ipəkdən) yaşıl libaslar olacaq, onlara gümüşdən bilərziklər taxılacaqdır. Rəbbi onlara çox pak bir şərab içirdəcəkdir" deyə vəsf edər.

Nəbə surəsi 24-cü ayəti də " Lə yəzukunə fihə bərdən və şərəbən=Onlar (atəşdəkilər) orada bir sərinlik və şərab (bir məşrubat) dadmazlar" deyə onlar təsvir edər.

Bəqərə surəsinin 259-cu ayətində şərab içəcək /məşrubat anlamına anıldığı kimi, Fatir surəsi-12ci ayətində də dadlı su içməsi (şərabı), rahat bir nemət olaraq anılır.

Həmçinin əlavə olaraq qeyd etmək olar ki, Hz.Muaviyyənin burda içdiyi içəcək ləbəndir ki, bunu İbn Əbu Şeybənin *"Musənnəf"*ində keçən hədis açıqlığa qovuşdurmaqdadır. Hz.Muaviyyənin ilk içdiyi Ləbəndir=(Süd yaxud Ayran). İmam İbni Əbu Şeybənin *"Musənnəf"*ində keçən bənzər bir hədis bu hadisəni açıqlığa qovuşdurmaqdadır ki,o hədis budur حدثنا زيد بن الحباب عن حسين بن واقد قال حدثنا عبد الله بن بريدة قال : قال : دخلت أنا وأبي على معاوية فأجلس أبي على السرير وأتى بالطعام فأطعمنا ، وأتى بشراب فشرب ، فقال معاوية ، ما شئ كنت أستلذة وأنا شاب فأخذه اليوم إلا اللبن ، فإني آخذه كما كنت آخذه قبل اليوم ، والحديث الحسن
Bureydə dedi: “Mənim atam və mən Muaviyyənin yanına daxil oldu və o bizi yatağın üzərində oturtdu və bizə biraz yemək və içəcək gətirdi. O içdi və dedi: Bu gün mənə halədə gənc bir adam kimi Ləbəndən və yaxşı sözdən daha ləzzət verən bir şey yoxdur, keçmişdə istifadə etdiyim kim bu gündə (Ləbən-süd yaxud ayran) qəbul edirəm”. *"Musənnəf İbn Əbu Şeybə"*-də görəcəyiniz kimi Hz.Muaviyyə Hamri içmir sadəcə onun haqqında danışır və sonra məsələni ləbənə dəyişdirir və ləbəni (südü yaxud ayranı) içir. Qeyd edim ki, bu hədisin də isnadı səhihdir. İbni Əbu Şeybədəki və *"Müsnəd"*dəki hədislərin isnadları eynidir, həmçinin Hz.Muaviyyənin (r.a) içki içməsi məntiqli olmazdı, çünki "*Müsnəd"* Əhməddə #16244, #16256, #16265, #16283, və #16318. hədislərdə Hz. Muaviyyə içki içənlərin şallaqlanmasını əmr etməkdədir.

Əl Aməş Səhabə düşməni rafizilərin düşüncə tərzini

çox gözəl təsvir etməkdədir, çünki rafizi dəcallar öz məzhəblərini belə məsələlər üzərində inşa etmişlərdir.
وما أجمل أن يقال هنا ما قاله الأعمش – رحمه الله – : ” حدثناهم بغضب أصحاب محمد الله صلى عليه وسلم فاتخذوه دينًا (2)

(2) سير اعلام النبلاء (394/2)

Əl Aməş (rah) dedi: Biz onlara Rasulullahın (s.a.s) əshabının nəyə qəzəbləndiyini söylədik, (lakin) onlar onu dinləri olaraq aldılar.

## II Hissə

## HƏZRƏTİ MÜAVİYYƏNİN (r.a) FƏZİLƏTLƏRİ

### Qur'anın səhabələrə verilən mükafatlar haqqında bəyanı (hansı ki, Hz.Muaviyyə (r.a) də daxildir)

İlk öncə Qur'ani Kərimdə Hz.Muaviyyədə (r.a) daxil olmaqla bütün səhabələrin cənnət əhli olduqlarını və onlar üçün Allahın ən gözəl mükafat olaraq cənnəti vəd etdiyini bildirən ayəti göstəmək istərdim. Necə ki, Uca Allah buyurur: " ***Sizə nə olub ki, (malınızdan) Allah yolunda xərcləmirsiniz? Halbuki göylərin və yerin mirası Allahındır. Sizlərdən (Məkkənin) fəthindən əvvəl xərcləyib döyüşənlər (başqaları ilə) eyni deyillər. Onların dərəcəsi (mallarını***

***fəthdən) sonra xərcləyib döyüşənlərdən daha üstündür. <u>Amma Allah onların hamısına ən gözəl olanı vəd etmişdir.</u> Allah sizin nə etdiklərinizdən xəbərdardır.. " [57:10]***

Bu ayətin təfsirində İmam Qurtubi rahiməhullah buyurur:

وَكُلاًّ وَعَدَ ٱللَّهُ ٱلْحُسْنَىٰ } أي المتقدمون المتناهون السابقون، والمتأخرون { اللاحقون، وعَدَهم الله جميعاً الجنة مع تفاوت الدرجات

Yəni Mutəqəddimin (öncəkilər) və Mutaəxxirin (sonrakılar), Allah hamısına cənnəti vəd etmişdir, hətta onların dərəcələri fərqli olsa belə. *(Təfsir əl Qurtubi 57/10)*

## <u>Əhl'i Sünnənin Səhabə düşmənləri haqqında əqidəsi</u>

İmam Təhavi (r.a) Əhl'i Sünnənin əqidəsi haqqında danışarkən deyir:

ونحب أصحاب رسول الله صلى الله عليه وعلى آله وسلم ، ولا نفرط في حب أحد منهم ، ولا نتبرأ من أحد منهم ، ونبغض من يبغضهم ، وبغير الخير يذكرهم ، ولا نذكرهم إلا بخير ، وحبهم دين وإيمان وإحسان ، وبغضهم كفر ونفاق وطغيان .

"Biz Rasulullahın (s.a.s) əshabını sevirik, onlardan heç birini sevməyi ehmal etmirik və onlardan heç birini rədd etmirik. Onlara nifrət edənə və tənqid edənə nifrət edirik və onları sadəcə xeyirlə anırıq. Onları sevmək dinin, imanın və ehsanın bir parçasıdır.

Onlara nifrət etmək küfrün, nifaqın və tüğyanın bir parçasıdır”.

Əl Utbi (Maliki Fəqihi) dedi: Səhnundan (Maliki fəqihi 160 h –dən 240 h) soruşdum:

فإن شتم أحدا من أصحاب النبي - عَلَيْهِ السَّلَامُ - أبا بكر أو عمر أو عثمان أو عليا أو معاوية أو عمرو بن العاص؟ فقال: أما إذا شتمهم، وقال: إنهم كانوا على كفر وضلال قتل، وإن شتمهم بغير هذا كما يشتم الناس رأيت أن ينكل نكالا شديدا.

“Əgər bir kimsə Rasulullahın (s.a.s) əshabından Əbu Bəkr, Ömər, Osman, Əli, Muaviyyə yaxud Amr ibn Əl As kimilər haqqında pis danışarsa (onun hökmü nədir)? O(Səhnun) dedi: Onlardan birinin küfrə və dəlalətə düşdüyünü söylərsə öldürülər, yaxud ( onların dəlalət əhli olmadığını söyləyib yenə də buna baxmayaraq) digər (avam) insanlar kimi şətm edərsə yenə də ciddi bir şəkildə cəzalandırılar”.
*(Ütbə bunu Əl Müstəxrəcində, İbni Əbi Zəmin Üsul Əs Sünnəsində səh 309, İbn Rüşd, Şərh Əl Müstəxrəcində 16 /420, Qadi İyad Əş-Şifasında 2/600 zikr etmişdir)*

## **Səhabənin arasında çıxan ixtilaflara görə onlar üçün mənfi danışılmaması haqqında icmanın olması**

Əl Hafiz İbni Həcər yazır:

وَاتَّفَقَ أَهْلُ السُّنَّةِ عَلَى وُجُوبِ مَنْعِ الطَّعْنِ عَلَى أَحَدٍ مِنَ الصَّحَابَةِ بِسَبَبِ مَا وَقَعَ لَهُمْ مِنْ ذَلِكَ وَلَوْ عَرَفَ الْمُحِقَّ مِنْهُمْ لِأَنَّهُمْ لَمْ يُقَاتِلُوا فِي تِلْكَ الْحُرُوبِ إِلَّا عَنِ اجْتِهَادٍ وَقَدْ عَفَا اللَّهُ تَعَالَى عَنِ الْمُخْطِئِ فِي الِاجْتِهَادِ بَلْ ثَبَتَ أَنَّهُ يُؤْجَرُ

أَجْرًا وَاحِدًا وَأَنَّ الْمُصِيبَ يُؤْجَرُ أَجْرَيْنِ

"Əhl'i Sünnə icma etmişdir ki, əgər bir kimsə aralarında hər hansı bir grupun haqlı olduğunu bilsə belə səhabələr arasında baş vermiş ixtilafa görə iftira atmamaq (pis danışmamaq, qarşı çıxmamaq) vacibdir, çünki onlar bu savaşlarda (ictihadlarında) haqlı olduqlarını düşündükləri şeydən başqa bir şey üçün savaşmamışlardır, və uca Allah (c.c) ictihadında xəta edəni bağışlamışdır. Əlbəttə (xəta edənə) bir səvab və doğru olanada iki səvab veriləcəkdir". *(Fəth əl Bari , 13/34)*

Əbu Muhəmməd Əbdurrahmən ibni Əbu Hətim dedi:

"Atama və Əbu Zürəyə bütün diyarlarda gördükləri alimlərin Əhli sünnətin dinin əsasları haqqındakı mövqeyini  və onların bunlardan nəyə inandıqları haqqında soruşdum Onlar dedilər: "Hicazda, İraqda, Şamda və Yəməndə bütün alimlərə çatdıq və onların mövqeyi:

والترحم على جميع أصحاب محمد والكف عما شجر بينهم.

"...Muhammədin (s.a.s) bütün əshabı haqqında Allahdan rəhmət diləmək və onlar arasında baş vermiş məsələlər (ixtilaflardan) qaçınmaq" (idi). *(Üsul Əl etiqad Əhlüs-Sunnə 321)*

## Hədis və Əsarlarda Hz.Muaviyyənin (r.a) fəziləti

### Dəlil 1: Rasulullah (s.a.s) Hz.Muaviyyənin əzabdan qorunması üçün dua etmişdir

Rasulullah(s.a.s) dedi:

**قال أبو مسهر عن سعيد بن عبد العزيز عن ربيعة بن يزيد عن عبد الرحمن بن أبي عميرة - وكان من أصحاب النبي ﷺ - عن النبي - ﷺ - قال : ( اللهم علم معاوية الحساب وقِهِ العذاب ) .**

"Allahım Muaviyyəyə hesabı öyrət və onu (cəhənnəm) əzabından qoru" *(İbni Asakir 16/684, 686, Müsnəd Shamin 190)*

**a)** Əlbani bu haqda deyir: "İsnad mənə görə Ceyyiddir (yaxşıdır), ravilər siqədir və İbni Əbu Umeyr xaricində Səhih Müslimin ravilərindəndir ki, o (İbni Əbi Umeyrdə) səhabədir." *(Silsilə əs Səhihə cilt 7 səh no: 690 hədis no: 3227)*

**b)** İbni Əsakir hədisi *"Tarix Mədinatul Diməşq"*də (59 /106) mötəbər saymışdır, Nəsiruddin əl-Əlbani *"Silsilə əs-Səhihə cilt 7 səh 694 Hədis no: 3227"* bunu sitat gətirmişdir.

**c)** İmam İbni Kəsir İbni Əsakirin fikriylə razılaşmış və onu bu səbəbdən tərifləmişdir. *(Əl Bidayə Vən Nihayə 8/160)*

**d)** İmam Əz-Zəhəbi dedi:

هذا الحديث رواته ثقات، لكن اختلفوا في صحبة عبد الرحمن، والأظهر أنه صحابي،

"Bu hədisin raviləri siqədir, lakin Əbdur Rahmənin ( İbni Əbu Umeyrin) səhabə olmasında ixtilaf vardır. Lakin daha doğru olan onun səhabə olduğudur". *(Tarixil İslam 4/309)*

**e)** İbni Həcər rahiməhullah *"Əl İsabə"*sində zikr etdiyi dörd hədisin isnadını mötəbər sayaraq Əbdurrahmən ibni Əbu Umeyrin (r.a) səhabədən olduğunu isbat etməyə çalışmışdır. Dört hədisi zikr etdikdən sonra o deyir:

وهذه الأحاديث وإن كان لا يخلو إسناد منها من مقال فمجموعها يثبت لعبد الرحمن الصحبة.

"Hətta bunların isnadlarında problem olduğu düşünülsə belə bunların hamısı Əbdurrahmənin səhabə olduğunu isbat edir"

Sonra İmam İbni Həcər Rasulullahın (s.a.s) Hz. Muaviyyəyə (r.a) dua etdiyi hədis haqqında deyir:

مع أنه ليست للحديث الأول علّة الاضطراب، فإن رواته ثقات، فقد رواه الوليد بن مسلم، وعمر بن عبد الواحد، عن سعيد بن عبد العزيز، فخالفا أبا مسهر في شيخه، قالا : عن سعيد عن يونس بن ميسرة، عن عبد الرحمن بن أبي عميرة. أخرجه ابن شاهين، من طريق محمود بن خالد عنهما. وكذا أخرجه ابن قانع من طريق زيد بن أبي الزرقاء، عن الوليد بن مسلم.

"Birinci hədisdə izdirab illəti yoxdur, raviləri siqədir və o Vəlid ibni Müslim və Ömər İbni Əbdulvahid tərəfindən Səid İbni Əbduləzizdən rəvayət edilmişdir"

*(Əl İsabə cild 4 səh 288)*

## **Dəlil 2: İmam Əhmədən gələn digər bir nəql: Rasulullah (s.a.s) Hz.Muaviyyənin (r.a) əzabdan qorunması üçün dua etmişdir**

İmam Əhməd *"Fəzail əs-Səhabə"*sində yazır:

**عن معاوية عن يونس بن سيف عن الحارث بن زياد عن أبي رهم عن العرباض بن سارية - رضي الله عنه - قال سمعت رسول الله - صلى الله عليه وسلم - وهو يدعونا إلى السحور في شهر رمضان : ( هلموا إلى الغذاء المبارك ) ، ثم سمعته يقول : ( اللهم علم معاوية الكتاب والحساب وقه العذاب ) .**

"Əl Ərbad bin Səriyyə əs Suleymi (r.a) Rasulullahın (s.a.s) belə dediyini eşitdiyini nəql edir: "Rasulullah ( s.a.s) insanları ramazanda sahura dəvət edirdi. O (s. a.s) dedi: ***"Mübarək yeməyə gəlin"*** və O, Rasulullah-ın belə dua etdiyini eşitdi: ***"Ey Allahım, Muaviyyəyə hesabı və kitabı öyrət və onu əzabdan qoru".*** *(Fəzail əs-Səhabə Mühəqqiqi dedi: İsnadi Həsən Liğeyrihidir, Hafiz əz-Zəhəbi dedi: "Bu hədis (öncəki) hədisin güclü şahididir (Siyər Aləm Ən Nubəla 3/124), İbn Xuzeymə öz "Səhih"ində 3/214 nəql etmişdir, İbn Hibban "Əl İhsan Kitab Mənaqıb əs Səhabə"-də "Muaviyyə ibni Əbu Sufyan radiyallahu anh" adlı bölümündə qeyd etmişdir cild 16 səh 191, Şeyx Zübeyr Əli Zai dedi "İsnadı Həsəndir" Fədail əs-Səhabə təhqiqi səh 128-də və Məcəlləh əl hədis no: 29 səh 62) kitablarında, Əlbani dedi isnadı Həsəndir ( Əs-Səhihə cild 7 səh 688))*

**Bu Hədisin Mürsəl Şahidi:**

**حدثنا أبو المغيرة ، ثنا صفوان قال : حدثني شريح بن عبيد أن رسول الله - ﷺ - دعا لمعاوية بن أبي سفيان : ( اللهم علمه الكتاب والحساب وقه العذاب ) .**

"Şərih ibni Ubeyd dedi: ***"Muaviyyəyə kitabı və hesabı öyrət və onu əzabdan qoru"***. *( İmam Əhməd , Fədail əs Səhabə, hədis no: 1749; Kitabın Mühəqqiqi hədisin irsal səbəbindən zəif olduğunu, lakin ravilərinin siqə olduğunu söyləməkdədir. Bu Hədis öncəki hədisi daha güclü edir və onu Həsən Ləğeyrihi qılır)*

**a)** İmam Əhməd Yuxarıdakı hədisi *"Fədail əs-Səhabə"* sində *"Muaviyyə bin Əbu Sufyan radiyallahu anhın fəziləti"* bölməsində zikr etməkdədir.

Əl Xəllal *"Əl İlal"* səh 141-də yazır:
**قَالَ مُهَنَّأٌ: سَأَلْتُ أَبَا عَبْدِ اللَّهِ، عَنْ حَدِيثِ مُعَاوِيَةَ بْنِ صَالِحٍ، عَنْ يُونُسَ بْنِ سَيْفٍ، عَنِ الْحَارِثِ بْنِ زِيَادٍ، عَنْ أَبِي رُهْمٍ، عَنِ الْعِرْبَاضِ بْنِ سَارِيَةَ، قَالَ: دَعَانَا النَّبِيُّ (صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ) إِلَى الْغَدَاءِ الْمُبَارَكِ، وَسَمِعْتُهُ يَقُولُ: "اللَّهُمَّ عَلِّمْهُ -يَعْنِي: مُعَاوِيَةَ- الْكِتَابَ وَالْحِسَابَ، وَقِهِ الْعَذَابَ".**

**فَقَالَ: نَعَمْ؛ حَدَّثَنَاهُ عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ.**
**قُلْتُ: إِنَّ الْكُوفِيِّينَ لا يَذْكُرُونَ هَذَا: "عَلِّمْهُ الْكِتَابَ وَالْحِسَابَ، وَقِهِ الْعَذَابَ"، قَطَعُوا مِنْهُ؟**
**قَالَ: كَانَ عَبْدُ الرَّحْمَنِ لا يَذْكُرُهُ، وَلَمْ يذكره إلا فيما بيني وبينه.**
"Mühənna dedi: "Əbu Abdullaha (İmam Əhmədə) Muaviyyə ibni Saləhin Yunas ibni Seyfdən o da Əl Haris İbi Ziyaddan o Əbu Rahumdan o da Əl Ərbad ibni Səriyyədən olan hədisi haqqında (hansi ki, hədis

belədir) ***"Rasulullahın (s.a.s) belə dediyini eşitdim: " Rasulullah (s.a.s) insanları ramazanda sahura də-vət edirdi. O (s.a.s) dedi: "Mübarək yeməyə gəlin" və O, Rasulullahın belə dua etdiyini eşitdi: "Ey Allah-ım, Muaviyyəyə hesabı və kitabı öyrət və onu əzab-dan qoru"*** haqqında sual edildi. Əhməd dedi: "Bəli, bunu Əbdul Rahmən ibni Mehdidən o da Muaviyyə ibn Salehdən (nəql etdiyini) eşitdim". Kufəlilər (yəni şiələr) bu sözləri ***"Allahım, Muaviyyəyə hesabı və kitabı öyrət və onu əzabdan qoru"*** zikr etmir və onu kəsirlər. O dedi: "Əbdurrahmən mənimlə onun arasında olan heç kimsəyə bu sözlərin heç birini zikr etmədi".

Bu hədis Kufəlilərin bu ziyadəni zikr etmədiklərinə dəlildir, lakin İmam Əhməd və onun tələbəsi Mu-hənna bu rəvayəti tənqid etməmişlərdir. Bu səbəb-dəndir ki, İmam Əhməd bu hədisi *"Fədail əs Səhabə"* sində *"Muaviyyə ibni Əbu Sufyanın fəzilətləri"* bölü-mündə zikr etmişdir.

**b)** İbni Əbu Yəla dedi: Əbul Həfs Əkbəri dedi: Eşit-dim ki, Şeyx İbni Bətta, Əbu Bəkr ibni Əyyubdan eş-itdi ki, İbrahim əl Hərbiyə (İmam Əhmədin tələbəsi) "Hələf bil təlaq" haqqında sual edildi ki, əgər Mua-viyyə cənnət əhlidirsə Təlaq sənə vacibdir, hansı ki, o (bu suala) belə cavab verdi: Təlaq olmayacaq və de-di:

**والدليل على ذلك ما روى العرباض بن سارية أنه سمع النبي - صلى الله**

**عليه وسلم - يقول لمعاوية بن أبي سفيان: " اللهم علمه الكتاب والحساب وقه العذاب " فالنبي مجاب الدعاء فإذا وقى العذاب فهو من أهل الجنة**

“Bu barədə dəlil Əl Ərbadın Rasulullahdan (s.a.s) Muaviyyə (r.a) haqqında eşitdiyi:” ***Allahım, Muaviyyəyə hesabı və kitabı öyrət və onu əzabdan qoru”*** hədisidir. Peyğəmbərin (s.a.s) duaları qəbul olunandır, bu səbəbdən o (Muaviyyə) əzabdan qorunmuş və cənnət əhlidir”. *(Təbaqat əl Hənəbilə 2/163)*

Bu dəlildir ki, uləma bu hədisi mötəbər saymış və bunu Hz.Muaviyyənin (r.a) cənnət əhli olduğuna dəlil göstərmişlərdir.

**c)** İbni Xuzeymə bunu öz səhihində *(Səhih ibni Xuzeymə 3/214)*-də zikr etmişdir ki, bu da hədisin onun səhih saydığını göstərməkdədir

**d)** İmam Zəhəbi dedi ki, bu hədis güclü bir şahiddir. *(Siyər 3/124)*

**e)** İbni Hibban bu hədisi *“Əl İhsan mənaqıb əs Səhabə”* kitabının *“Muaviyyə ibni Əbu Sufyan radiallah anh”* adlı bölümündə zikr etmişdir.

**f)** Şeyx Muhamməd Əmin əş-Şənqiti bu hədisin İbni Xuzeymə və İbni Hibban tərəfindən mötəbər sayıldığını söyləmiş və özüdə hədisi mötəbər saymışdır. *(Əl Əhədis ən-Nəbəviyyə fi Fədail Muaviyyə bin Əbu Sufyan səh 30-31)*

**g)** İbni Qəttan əl Fasi (v.628 h) deyir: حديثه حسن.-“Hə-

dis Həsəndir" *(İkmal Təhzib əl Kamal 3/290)*

**h)** İmam Əl Corqani (v.543 H) öz kitabının :" بَابٌ: فِي فَضَائِلِ طَلْحَةَ، وَالزُّبَيْرِ، وَمُعَاوِيَةَ، وَعَمْرٍو-*"Talha, Zubeyr, Muaviyyə və Amrın fəzilətləri Babı"*-nda dedi:

هَذَا حَدِيثٌ مَشْهُورٌ، رَوَاهُ عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ جَمَاعَةٌ مِنْهُمْ: بِشْرُ بْنُ السَّرِيِّ، وَاللَّيْثُ بْنُ سَعْدٍ، وَعَبْدُ اللَّهِ بْنُ صَالِحٍ، وَأَسَدُ بْنُ مُوسَى، وَغَيْرُهُمْ
"Bu məhşur hədisdir və bir qrup bunu Muaviyyə ibni Salehdən nəql etmişlərdir. Bunların arasında Bişr ibni Sari, Leys ibni Sad, Abdullah ibni Saleh, Əsəd ibni Musa və başqaları vardır"

Sonra O : ***"Allahım Muaviyyəyə hidayət et, onu hidayətedici qıl və insanları onunla hidayətə çatıdır"*** hədisini nəql etdikdən sonra deyir:

> هَذَا حَدِيثٌ حَسَنٌ-"Bu Hədis Həsəndir" *(Əl Əbatil vəl Mənakir əs-Səhah vəl Məşahir lil Corqani 1/343 no . 182)*

**x)** Şeyx Zubeyr Əli dedi: "İsnadı Həsəndir"*(Fədail Əs Səhabə təhqiqi səh 128)*

**i)** Əlbani dedi: "İsnadı Həsəndir" *(Əs-Səhihə cild 7 səh 688)*

**Not:** Səhabə düşmənləri, İbni Ədinin Muaviyyə ibn Saleh bu hədisi zikr etməkdə yalnız qalmışdır sözünü sitat gətirməyə çalışırlar (ki, həqiqətdə bu belə de-

yil). Lakin bu onlara dəlil sağlamaz, çünki İbni Ədinin özü Hz.Muaviyyə daxil bütün səhabələri sevirdi. İbni Adi deyir:

إن أصحابَ النبيِّ ﷺ لِحَقِّ صُحبَتهم، وتقادُمِ قَدمهم في الإسلام، لكلِّ واحد منهم في نفسه حقٌ وحُرمةٌ للصُّحبة، فهُم أجلُّ من أن يتكلّم أحدٌ فيهم

"Səhabə olmaları və İslamı bizdən öncə qəbul etmələri səbəbindən bu Rasulullahın (s.a.s) haqqı və hörmətidir. Bu səbəbdən onların məqamı bizim onlar haqqında (pis) danışmamızdan çox ucadır".
*(əl Kamil ibn Adi 3/1064)*

**Dəlil 3: Rasulullah (s.a.s) Hz.Muaviyyənin (r.a) hidayət olunması, hidayətçi olması və onun vasitəsilədə insanların hidayətə çatması üçün dua etmişdir**

**حَدَّثَنَا مُحَمَّدُ بْنُ يَحْيَى، حَدَّثَنَا أَبُو مُسْهِرٍ عَبْدُ الأَعْلَى بْنُ مُسْهِرٍ، عَنْ سَعِيدِ بْنِ عَبْدِ الْعَزِيزِ، عَنْ رَبِيعَةَ بْنِ يَزِيدَ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي عَمِيرَةَ، وَكَانَ، مِنْ أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ لِمُعَاوِيَةَ " اللَّهُمَّ اجْعَلْهُ هَادِيًا مَهْدِيًّا وَاهْدِ بِهِ " . قَالَ أَبُو عِيسَى هَذَا حَدِيثٌ حَسَنٌ غَرِيبٌ .**

"Rasulullah (s.a.s) Muaviyyə (r.a) haqqında dedi: ***"Allahım, onu (Muaviyyəni) hidayət edən və hidayət edilmiş et və onunla (insanlara) hidayət ver!"*** *(İmam Buxari,Tarix Əl Kəbir 5/240, Sünən ət-Tirmizi, Əlbani hədisi mötəbər saymışdır (Sahih Tirmizi 3/236))*

**a)** İmam Tirmizi bu hədisi *"Mənaqib Muaviyyə İbni Əbu Sufyan radiallahu anh"* bölümündə zikr etmiş və hədis haqqında "Həsən Qərib" demişdir.

**b)** İmam Zəhəbi yazır:

حَسَّنَهُ: التِّرْمِذِيُّ.-"Tirmizi dedi ki, hədis həsəndir" *(Siyər Aləm Ən Nubəla 3125)*

**İmam Zəhəbi İbnul Cəzvinin bu sözlərlə rədd etmişdir:**

"(İbnul Cəzvi) dedi ki, bu hədis Muhəmməd ibni İshaq əl Luluviyə dayanır ki, o siqə deyildir. (Zəhəbi cavab verir) Bu cəhalətdir, əksinə Muhəmməd ibni İshaq Əs Suğani siqədir, (o bu hədisi nəql etməkdə tək qalmamışdır) əksinə bu hədis Əbu Məhsərdən, Mərvan ibni Muhəmməddən və Vəlid Səiddən nəql etmişdir".

Ömər ibni Əbdul Vahid və Vəlid ibni Muslim Səiddən o Rəbiədən o da İbni İdrisdən hansı ki, o da Əbdulrahmən ibni Əbu Umeyrdən eşitmişdir. İsnadı güclüdür

Tirmizi Əbu İdrisdən başqasıyla nəql etmişdir. İbnul Cəzvi İsmail ibni Muhəmməd isnadıyla hansı ki, o Muhəmməd ibni Abbasdan o da Əbu Məşhərdən eşitmişdir. Dəraqutni dedi: "İsmail ibni Muhəmməd yalançıdır".

(Əz Zəhəbi cavab verir) bu da başqa bir yanlış anlamadır. Bu İsmail (ibni Muhəmməd) əs səffardır ki, siqədir. Dəraqutninin yalançı dediyi (İsmail ibni Muhəmməd) Əl Muznidir. Əbu Nuaym ondan nəql etmişdir". *(Əz-Zəhəbi, Təlxis əl İlal əl Mutənahiyə no. 225)*

**c)** Şeyx Zubeyr Əli Deyir: "Tirmizi dedi ki, bu hədis "Həsən Qərib"dir (3842), Buxari *"Tarixul Kəbir"*ində 5/240, İbni Sad *"Ət-Təbəqat"*ında(7/457), İbni Asim *" Əl Əhəd vəl Muthəna"*sında (2/385 hədis 1129), *" Müsnəd Əhməd"*də (4/216 h 17895.) nəql edilmişdir, isnadı səhihdir".

**d)** Şeyx Şuayb Ərnəut dedi: "Raviləri siqədir və içlərində səhihin (Buxari və Müslimin) raviləri vardır". *(Təhqiq "Müsnəd Əhməd" Hədis no:17926)*

**e)** İmam Əl Corqani (v.543 H) بَابٌ: فِي فَضَائِلِ طَلْحَةَ، وَالزُّبَيْرِ، وَمُعَاوِيَةَ، وَعَمْرٍو –Təlha, Zubeyir, Amr və Muaviyyənin fəzilətləri babında - dedi:
هَذَا حَدِيثٌ حَسَنٌ- "Bu hədis Həsəndir" *(Əl Əbatil vəl Mənakir əs-Səhəh vəl Məşahir lil Corqani 1/341 no. 182)*

**f)** Əl Əcurri *"Əş-Şəriyyə"*sində كِتَابُ فَضَائِلِ مُعَاوِيَةَ بْنِ أَبِي سُفْيَانَ رَضِيَ اللَّهُ عَنْهُ-*"Muaviyyə ibni Əbu Sufyan radiyallahu anhın fəzilətləri kitabı"* adlı hissədə bu hədisi zikr etməkdədir.

**g)** Şeyx Muhəmməd ibni Əmin əş-Şənqiti deyir:

**أخرج الإمام البخاري بسند صحيح في التاريخ الكبير (5|240): عن أبي مسهر حدثنا سعيد بن عبد العزيز عن ربيعة بن يزيد عن (الصحابي عبد الرحمن) بن أبي عميرة قال: قال النبي ﷺ لمعاوية: «اللهم اجعلهُ هادِياً**

«مَهديّاً واهده واهدِ به».

"Bu Buxari tərəfindən *"Tarixul Kəbir"*də (5/240) səhih isnadla nəql edilmişdir. Əbu Musəxxərdən o Seyyid ibni Əbdüləzizdən o Rəbii ibni Yeziddən o da (Səhabə) İbni Əbu Umeyrədən nəql etdi ki, Rasulullah (s. a.s) dedi: ***"Allahım, onu (Muaviyyəni) hidayət edən və hidayət edilmiş et və onunla (insanlara) hidayət ver!"***. *(Əhədis ən-Nəbəviyyə fi fəzail Muaviyyə ibn Əbu Sufyan səh no. 9)*

**h)** İbni Əsakir *"Tarix"*-ində hədisi mötəbər saymışdır

**i)** İbni Kəsir hədisi mötəbər saymış və "Muaviyyənin biografiyası və idarəçiliyinin təzkirəsi, onun fəzilətləri və Mənaqıbı" başlığı altında zikr etmişdir.

**j)** İmam Əbul Qasım Lilkayi bunu "Rasulullahdan (s. a.s) Əbu Əbdurrahman Muaviyyə ibni Əbu Sufyan radiyallahu anhumanın fəzilətlərinə dair nəql edilənlər" başlığı altında zikr etmişdir.

**k)** Mahmud Şükrü Əl Əlusi dedi: فإن لهذا الحديث شواهد كثيرة تؤكد صحته.-Bu Hədisin onu səhih qılan bir çox şahidi vardır. *('Ədəb 'əlā mən səbbə əl-əṣḥāb 427)*

**i)** İbni Həcər əl Heysəmi yazır:
إن الحديث حسن"-"Bu Hədis Həsəndir" *(Əl-Səvaiq Əl Muhriqa 2/626)*

Qeyd: Əlusi bir çox məsələdə İbni Həcərə qarşı olsa da, Muaviyyə barəsində kitab yazdığı üçün onu tərifləmişdir.

وقد ألف العلامة ابن حجر المكي كتابا جليلا في مناقبه (تطهير الجنان واللسان عن الخطور والتفوه بثلب معاوية بن أبي سفيان مع المدح الجلي وإثبات الحق العلي لمولانا أمير المؤمنين علي)

"Əllamə İbni Həcər əl Məkki Muaviyyənin fəzilətlərinə dair gözəl bir kitab yazmışdır". *(ʻƏdəb ʻəlā mən səbbə əl-əṣḥāb 425)*

## Dəlil 4: Muaviyyə (r.a) fəqih idi

İbni Əbu Məryəm, İbn Əbu Muleykə'nin belə dediyini rəvayət etmiştdr: "İbn Abbas'a deyildi ki: "Mömünlərin əmiri Muaviyyə haqqında nə deyirsən? O sadəcə bir rükatlıq vitr namazı qıldı?" İbn Abbas da bu cavabı verdi: "İsabət etmişdir. Çünki o fəqihdir." *(Buxari kitab #57, Hədis #109)*

## Fayda: Əbu Zərr'lə (r.a) Hz.Muaviyyə (r.a) arasında olan fiqhi münazirə:

Zeyd ibni Vəhb nəql edir: Rəbəzə`yə uğramışdım. Orada Əbu Zərr (ra)`i gördüm. Ona: "Səni buraya gətirən səbəb nədir?" diyə soruşdum. Belə izah etdi: "Şam`daydım. Bir ayət haqqında Muaviyyə (r.a) ilə ixtilafa düşdük. Ayət bu: ***"Ey iman edənlər! Hahamlar və rahiblərin çoxu, insanların mallarını haqsızlıqla yeyirlər. Allah yolundan sapdırılar. Qızıl və***

***gümüşü yığıb Allah yolunda sərf etməyənlərə şiddətli bir əzabı müjdələ. Bunlar cəhənnəm atəşində qızdırıldığı gün, alınları, böyürlər və kürəkləri onlarla dağlanacaq. Bu, özünüz için saxladığınızdır, saxladıqlarınızı dadın" deyiləcək". (Tövbə, 34-35)***
Muaviyə (ra): "Bu ayət əhli kitab haqqına enmişdir" dedi. Mən isə: "Həm bizim, həm də onlar haqqında endi" dedim. Bu məsələ üzərində aramızda ixtilaf çıxdı. Xəlifə Hz. Osman (r.a)`a yazaraq məni şikayət etdi. Hz. Osman mənə yazaraq Mədinə`yə gəlməmi əmr etdi. Bunun üzərinə Mədinə`yə gəldim. Xalq, sanki daha öncə məni heç görməmiş kimi, uşaqları ilə ətrafımı sardı. Vəziyyəti Osman (r.a)`a söylədim. Mənə: "İstərsən buraya yaxın bir yerə get" dedi. Məni buraya gətirən gerçək səbəb budur. Mənim üzərimə Həbəşli siyahi bir qulu əmir təyin etsələr mütləq dinləyər, itaət edərəm". *(Səhih Buxari, Təfsir bölümü, Hədis No 644)*

İmam İbni Həcər Əl Əsqəlani bu hədisdən bir çox hökm çıxarmışdır. O yazır:

وفي الحديث من الفوائد غير ما تقدم : أن الكفار مخاطبون بفروع الشريعة لاتفاق أبي ذر ، ومعاوية على أن الآية نزلت في أهل الكتاب . وفيه ملاطفة الأئمة للعلماء ، فإن معاوية لم يجسر على الإنكار عليه حتى كاتب من هو أعلى منه في أمره ، وعثمان لم يحنق على أبي ذر مع كونه كان مخالفا له في تأويله . وفيه التحذير من الشقاق والخروج على الأئمة ، والترغيب في الطاعة لأولي الأمر ، وأمر الأفضل بطاعة المفضول خشية المفسدة ، وجواز الاختلاف في الاجتهاد ، والأخذ بالشدة في الأمر بالمعروف وإن أدى ذلك إلى فراق الوطن ، وتقديم دفع المفسدة على جلب المصلحة لأن في بقاء أبي ذر بالمدينة مصلحة كبيرة من بث علمه في طالب العلم ، ومع ذلك فرجح

عند عثمان دفع ما يتوقع من المفسدة من الأخذ بمذهبه الشديد في هذه المسألة ، ولم يأمره بعد ذلك بالرجوع عنه ، لأن كلا منهما كان مجتهدا .

"Bu hədisdə şəriətin fürusunda kafirlərində muxatab alındıqlarını (da göstərən) bir çox faydalar vardır , hansı ki, Əbu Zərr və Muaviyyə bu ayətin *(Tövbə, 34-35)* əhl'i kitab haqqında endiyinə dair ittifaq etmişlərdir. Bu, idarəçilərin alimlərə sayğı duyduğunu sübut edir. Muaviyyə (o zaman vali idi) Əbu Zərri rədd etmədi, bu barədə Əmirəl Möminin Osmana (r. a) yazdı və Osmanda hər hansı sərt bir söz söyləmədi, əksinə ona Mədinə yaxınlığında yaşamasını söylədi. Burada idarəçinin əmrini qəbul etmənin və .. ictihadda fərqli fikirlərdə olmanın caizliyinə dair dəlil vardır. Osman (r.a) Əbu Zərr'dən fikrindən daşınmasını əmr etməmiş idi, çünki O (Əbu Zərr) müctəhid idi". *(Fəth əl Bari)*

## Dəlil 5: Muaviyyə (r.a) Vəhy katibi idi

İbni Abbas nəql edir ki, Allah Rəsulu (s.a.s) mənə dedi: ***"Get və Muaviyyəni mənə çağır",*** çünki o, Allahın vəhylərini Rasulullah (s.a.s) üçün yazardı. *(İmam Əhməd 2651 , Beyhəqi, Dəlail Ən Nubuvvə cild 6 səh 243 və Əlbani hədisi Silsilə əs-Səhihə (1-164)-də mötəbər saymışdır, Şeyx Zubeyr Əli hədisi zikr ettikdən sonra "isnadı həsən"dir deməkdədir Məcəllə Əl Hədis no: 29 səh 5)*

## Sələfin Hz.Muaviyyənin (r.a) vəhy katibi olduğuna dair fəhmi:

**a)** Riyah ibn Əl Cərrah dedi ki, bir nəfər Məafi ibn İmran (v.185 h)-dan soruşdu:

> يا أبا مسعود أين عمر بن عبد العزيز من معاوية بن أبي سفيان ؟ فغضب من ذلك غضبا شديدا ، وقال : لا يقاس بأصحاب رسول الله - ﷺ - أحد ، معاوية صاحبه ، وصهره ، وكاتبه ، وأمينه على وحي الله ،

“Bir nəfərin əl-Məafi bin İmran’dan soruşduğunu eşitdim: “Ey Əbu Məsud! Ömər bin Abdüləziz ilə Muaviyyə bin Sufyan arasında nə qədər fərq var? ”Onun qəzəbləndiyini gördüm və dedi: “Muhamməd’in - sallallahu aleyhi va səlləm - səhabələri ilə heç kəs müqayisə olunmaz. Muaviyə - radiyallahu anhu - onun katibi, səhabəsi, qaynı və vəhyini əmanət etdiyi kəsdir”. *(Tarix Bağdad 1/209 , Şeyx Zübeyr Əli "Fədail əs Səhabə"də səh 129-da bu hədisi mötəbər saymışdır,* həmçinin baxın الآجري 2466/5 واللالكائي 1445/8 وتاريخ بغداد 209/1 ومن طريقه الجورقاني 195/1]

**b)** Əl Əcurri (v.360) yazır:

> مُعَاوِيَةُ رَحِمَهُ اللَّهُ كَاتَبُ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى وَحْيِ اللَّهِ عَزَّ وَجَلَّ وَهُوَ الْقُرْآنُ بِأَمْرِ اللَّهِ عَزَّ وَجَلَّ

“Muaviyyə rahiməhullah Allah əzzə və cəllə-nin əmriylə Allahın vəhylərini Rasulullah (s.a.s) üçün yazan biri idi”. *(Əş-Şəriyə 5/2413)*

**c)** İmam İbni Əsakir bu barədə yazır:

**خال المومنين وكاتب وحى رب العالمين**

"Mömünlərin dayısı və Aləmlərin Rəbbinin vəhyinin katibi". *(Tarixi Diməşq 62/38)*

**Dəlil 6: Muaviyyə (r.a) Rasulullah (s.a.s) sevmiş və onun hədisiylə əməl etmişdir**

**a)** Ümmü Əlqəmə nəql edir ki, Muaviyyə ibni Əbu Sufyan Mədinəyə gəldi və Aişədən (r.a) örtük və Rasulullahın (s.a.s) saçını istədi. (Sonra) Muaviyyə özünü örtüklə bürüdü, saçı suya batırdı, (suyu içdi) və onu bədənin üzərinə qoydu. *(Tarix Diməşq 62/106 Və Şeyx Zübeyr Əli Dedi ki, "İsnadı Həsən"dir, Məcəllə əl Hədis, Hədis no: 29 səh 60)*

**Qeyd:** Bu rəvayət Hz.Muaviyyənin (r.a) Rasulullahı ( s.a.s) çox sevdiyinə və onun müqəddəs əmanətləri ilə bərəkətləndiyinə dəlildir.

**b)** İmam Əhməd nəql edir:

حدثنا مروان بن شجاع حدثني خصيف عن مجاهد عن ابن عباس

أنه طاف مع معاوية بالبيت فجعل معاوية يستلم الأركان كلها فقال له ابن عباس لم تستلم هذين الركنين ولم يكن رسول الله صلى الله عليه وسلم يستلمهما فقال معاوية ليس شيء من البيت مهجورا فقال ابن عباس لقد كان لكم في رسول الله أسوة حسنة فقال معاوية صدقت

"İbni Abbas deyir ki, o Muaviyyə ilə Beytullahı təvaf etdi. Muaviyyə Kəbənin bütün künclərini öpdü.

İbni Abbas dedi ki, nə üçün Rasulullahın (s.a.s) öpmədiyi küncləri öpürsən? Muaviyyə Beytullahda heç bir şeyin buraxılmaması gərəkdiyini söylədi.
İbni Abbas dedi: "Rasulullahın (s.a.s) həyatı sənin üçün örnəkdir". Muaviyyə dedi: "Haqlısan". *(Müsnəd Əhməd 1877, Şeyx Şueyb Əl Ərnəut dedi ki, Həsən Liğeyrihidr)*

**c)** Əbu Məryəm Əl Əzdi nəql edir: "Muaviyyənin yanına daxil olduğumda o: "Ey filan və falanın atası ( bu ərəblərdə bu vəziyyətlərdə işlədilən ifadədir) bizi ziyarət etmən necə də xoşdur" dedi. Mən dedim: "Sənə Rasulullahdan (s.a.s) bir hədis deyim: ***"Eşitdim ki, Rasulullah (s.a.s) dedi: "Əgər Allah bir kimsəni müsəlmanların işlərində idarəçi vəzifəyə gətirər və o kimsə özünü onların ehtiyaclarını, istəklərini və kasıblığını (təmin etməkdən) uzaq tutarsa, Allah özünü ondan uzaq tutar, onun ehtiyac və kasıblığını gedərməz".*** Muaviyyə dedi: "O (Muaviyyə) insanların ehtiyaclarını qarşılamaq üçün (bu andan etibarən) birini vəzifələndirdi". *(İsnad : Səhihdir (Əl-Əlbani), Sünən Əbu Davud 2948)*

Görüldüyü üzərə Hz.Muaviyyə(r.a) dərhal o hədislə əməl etmişdir.

**d)** Əbu Micləz dedi:

قَالَ خَرَجَ مُعَاوِيَةُ عَلَى ابْنِ الزُّبَيْرِ وَابْنِ عَامِرٍ فَقَامَ ابْنُ عَامِرٍ وَجَلَسَ ابْنُ الزُّبَيْرِ فَقَالَ مُعَاوِيَةُ لاِبْنِ عَامِرٍ اجْلِسْ فَإِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ " مَنْ أَحَبَّ أَنْ يَمْثُلَ لَهُ الرِّجَالُ قِيَامًا فَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنَ النَّارِ " .

“Muaviyyə İbni Əz Zubeyrə və İbn Əmirə (görməyə) getdi. (Onu görüncə) İbni Əmir ayağa qalxdı lakin İbni Əz Zubeyr oturmağa davam etdi. Muaviyyə İbni Əmirə dedi: ”Otur, çünki Rasulullahın (s.a.s) belə dediyini eşitdim: ***”Qarşısında insanların ayağa qalxmasını xoşlayan kimsə cəhənnəmdə yerini hazırlasın”.*** *(Əlbani dedi ki, isnadı səhihdir, Sünən Əbu Davud 5229)*

Əlbani bu hədis barəsində deyir:

و هذا معنى دقيق دلنا عليه

راوي الحديث معاوية رضي الله عنه ، و ذلك بإنكاره على عبد الله بن عامر قيامه

له ، و احتج عليه بالحديث ، و ذلك من فقهه في الدين ، و علمه بقواعد الشريعة

“Hədisin dəqiq mənası hədisin ravisi Muaviyyə radiyallahu anh tərəfindən bildirilmişdir. O, Abdullah ibni Amrı onun üçün ayağa qalxmasına mane olmuş və hədisdən onun dəlilini gətirmişdir. Bu, (Muaviyyənin) dində fəqihliyini və şəri məsələlərdə elmini (göstərir)”. *(Silsilə Əhədis əs-Səhihə 1/629)*

**e)** *”Müsnəd əl Humeydi”*də yazılıb:

حَدَّثَنَا الْحُمَيْدِيُّ قَالَ: ثنا سُفْيَانُ، قَالَ: ثنا عَمْرُو بْنُ دِينَارٍ، عَنْ نَافِعِ بْنِ جُبَيْرٍ، قَالَ: اسْتَعْمَلَ مُعَاوِيَةُ بْنُ أَبِي سُفْيَانَ جَرِيرَ بْنَ عَبْدِ اللَّهِ عَلَى سَرِيَّةٍ، فَأَصَابَهُمْ بَرِدٌ شَدِيدٌ، فَأَقْفَلَهُمْ جَرِيرٌ، فَقَالَ لَهُ مُعَاوِيَةُ: لِمَ أَقْفَلْتَهُمْ؟ قَالَ جَرِيرٌ: إِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ، يَقُولُ: «مَنْ لَا يَرْحَمُ النَّاسَ لَا يَرْحَمُهُ اللَّهُ» ،

فَقَالَ لَهُ مُعَاوِيَةُ: أَنْتَ سَمِعْتَ هَذَا مِنْ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ؟ قَالَ: نَعَمْ.

"Muaviyyə Cərir ibni Abdullahın komandirliyi altında ordu göndərdi, lakin havanın dayanılmaz şəkildə soyuq olması səbəbindən (Cəririn Əmri) ilə geri qayıtdılar. Muaviyyə (Cərirə) dedi: "Mənim icazəm olmadan nə üçün geri gəlmisiniz? (Cərir) dedi: Eşitdim ki, Allah Rəsulu (s.a.s) buyurdu: ***"İnsanlara mərhəmət etməyənə Allah mərhəmət etməz"*** (Yəni Mücahidlər dayanılmaz soyuqda olduqları üçün o geri gəlmək əmrini vermişdir). Muaviyyə dedi: "Bunu Rasulullahdanmı (s.a.s) eşitdin? O dedi: "Bəli".
*(Müsnəd Hümeydi, 2/50 no:822, kitabın Mühəqqiqi dedi ki, isnadı səhihdir)*

**f)** Muaviyyə (r.a) Ənsarı sevirdi.

İmam Əhməd nəql edir ki, Muaviyyə dedi: Rasulullahı (s.a.s) belə deyərkən eşitdim:

" مَنْ أَحَبَّ الْأَنْصَارَ، أَحَبَّهُ اللهُ عَزَّ وَجَلَّ، وَمَنْ أَبْغَضَ الْأَنْصَارَ، أَبْغَضَهُ اللهُ عَزَّ وَجَلَّ "

"Kim Ənsarı sevərsə Allahda onu sevər, Kim Ənsara qəzəb edərsə, Allah da ona qəzəb edər". *(Müsnəd Əhməd, 28/85, kitabın Mühəqqiqi dedi ki, hədis mötəbərdir)*

## Dəlil 7: İbn Abbas (r.a) Muaviyyənin (r.a) 4 xəlifədən sonra xilafət üçün ən uyğun kimsə olduğunu söyləmişdir

İbni Abbas dedi:

ما رأيت رجلا كان أخلق يعني للملك من معاوية

"İdarəçilik üçün (4 xəlifədən) sonra Muaviyyədən daha uyğununu görmədim". *(Tarix Diməşq 62/161 Şeyx Zubeyr Əli səhih isnadla Təhqiq, Fədail əs-Səhabə səh 128-də və Məcəllə əl Hədis no: 29 səh 62-də, Musənnəf Abdul Razzəq cild 11 səh 453 no: 20985)*

## Dəlil 8: İbn Ömər (r.a) Muaviyyənin (r.a) Peyğəmbərdən (s.a.s) sonra ən səxavətli kimsə olduğunu söyləmişdir

ما رأيت بعد رسول الله ﷺ أسود من معاوية

İbni Ömər dedi: "Rasulullahdan (s.a.s) sonra Muaviyyədən başqa daha Əsvəd bir kimsə görmədim".

İmam Əhməddən Əsvədin mənası haqqında soruşuldu, O dedi: "Onun mənası səxavətli deməkdir". *(Əs-Sünən əl Xəllal 679,680,681, Kitabın Mühəqqiqi dedi, İbni Ömərin ifadəsinin isnadı Həsəndir və Əhmədin ifadəsinin isnadı isə səhihdir)*

## Dəlil 9: Muaviyyə (r.a) möminlərin dayısıdır

**657** - أَخْبَرَنِي أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ مَطَرٍ، وَزَكَرِيَّا بْنُ يَحْيَى، أَنَّ أَبَا طَالِبٍ حَدَّثَهُمْ أَنَّهُ سَأَلَ أَبَا عَبْدِ اللَّهِ: أَقُولُ: مُعَاوِيَةُ خَالُ الْمُؤْمِنِينَ؟ وَابْنُ عُمَرَ خَالُ الْمُؤْمِنِينَ؟ قَالَ: نَعَمْ، مُعَاوِيَةُ أَخُو أُمِّ حَبِيبَةَ بِنْتِ أَبِي سُفْيَانَ، زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَرَحِمَهُمَا، وَابْنُ عُمَرَ أَخُو حَفْصَةَ زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَرَحِمَهُمَا، قُلْتُ: أَقُولُ: مُعَاوِيَةُ خَالُ الْمُؤْمِنِينَ؟ قَالَ: نَعَمْ "

Əbu Talibdən nəql edildi ki, O Əbu Abdullah (Əhməd ibn Hənbələ) "Muaviyyə mömünlərin dayısıdır" yaxud "İbn Ömər mömünlərin dayısıdır" deyimləri haqqında sual etdi.
O dedi: Bəli, Muaviyyə Rasulullahın (s.a.s) xanımı Ümmü Həbibə bint Əbu Sufyanın qardaşı və İbn Ömər Rasulullahın (s.a.s) xanımı Həfsənin qardaşıdır.
Mən dedim: Muaviyyəyə mömünlərin dayısı deyə bilərəmmi?
O dedi: Bəli

**658** - أَخْبَرَنَا أَبُو بَكْرٍ الْمَرُّوذِيُّ، قَالَ: سَمِعْتُ هَارُونَ بْنَ عَبْدِ اللَّهِ، يَقُولُ لِأَبِي عَبْدِ اللَّهِ: جَاءَنِي كِتَابٌ مِنَ الرَّقَّةِ أَنَّ قَوْمًا قَالُوا: لَا نَقُولُ: مُعَاوِيَةُ خَالُ الْمُؤْمِنِينَ، فَغَضِبَ وَقَالَ: «مَا اعْتِرَاضُهُمْ فِي هَذَا الْمَوْضِعِ، يُجْفَوْنَ حَتَّى يَتُوبُوا»

Harun ibn 'Abdullahdan nəql edildi ki, O, Əbu Abdullah (Əhməd ibn Hənbələ) dedi: Əl-Rəqqadan mənə bir məktub gəldi ki, bəzi insanlar deyirlər ki: Biz, Muaviyyə mömünlərin dayısıdır demirik. O, əsəbiləşdi və dedi: Niyə bu məsələyə etiraz edirlər? Onlar tövbə edənə qədər uzaqlaşdırılmalıdırlar.

**659** - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ أَبِي هَارُونَ، وَمُحَمَّدُ بْنُ جَعْفَرٍ، أَنَّ أَبَا الْحَارِثِ حَدَّثَهُمْ قَالَ: وَجَّهْنَا رُقْعَةً إِلَى أَبِي عَبْدِ اللَّهِ: مَا تَقُولُ رَحِمَكَ اللَّهُ فِيمَنْ قَالَ: لَا أَقُولُ إِنَّ مُعَاوِيَةَ كَاتِبُ الْوَحْيِ، وَلَا أَقُولُ إِنَّهُ خَالُ الْمُؤْمِنِينَ، فَإِنَّهُ أَخَذَهَا بِالسَّيْفِ غَصْبًا؟ قَالَ أَبُو عَبْدِ اللَّهِ: هَذَا قَوْلُ سَوْءٍ رَدِيءٌ، يُجَانَبُونَ هَؤُلَاءِ الْقَوْمِ، وَلَا يُجَالَسُونَ، وَنُبَيِّنُ أَمْرَهُمْ لِلنَّاسِ

Muhəmməd ibn Əbi Harun və Muhəmməd ibn Əbu Cəfərdən nəql edildi ki, Əbul Haris onlara dedi: Biz Əbu Abdullaha (Əhməd ibn Hənbələ) bir not göndərdik ki: Allah sənə mərhəmət etsin: Mən Müaviyyə vəhy katibidir və mömünlərin dayısıdır demirəm, çünki, o xilafəti qılıncla və zorla aldı?" Deyən bir kimsə haqqında nə deyirsən. Əbu Abdullah dedi: Bunlar pis sözlərdir və belə insanlardan qaçınılmaq və uzaqlaşdırmaq gərəkir və insanları onlar haqqında uyarmalıyıq.

**660** - وَأَخْبَرَنَا أَبُو بَكْرٍ الْمَرُّوذِيُّ، قَالَ: قُلْتُ لِأَبِي عَبْدِ اللَّهِ: أَيُّهُمَا أَفْضَلُ: مُعَاوِيَةُ أَوْ عُمَرُ بْنُ عَبْدِ الْعَزِيزِ؟ فَقَالَ: «مُعَاوِيَةُ أَفْضَلُ، لَسْنَا نَقِيسُ بِأَصْحَابِ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَحَدًا» . قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ: «خَيْرُ النَّاسِ قَرْنِيَ الَّذِينَ بُعِثْتُ فِيهِمْ»

Nəql edildi ki, Əbu Bəkr əl Mərvəzi dedi: Əbu Abdullaha (Əhməd ibn Hənbələ) dedim: Kim daha üstündür, Muaviyyə yoxsa Ömər İbn Əbduləziz? O dedi: Muaviyyə daha üstündür və Biz Rasulullah - sallallahu aleyhi və səlləmin - əshabını kimsəylə müqayisə etmərik. Rasulullah (sallalahu aleyhi və səlləm) - dedi: ***"İnsanların ən xeyirlisi mənim (elçi olaraq) göndərildiyim zamanın insanlarıdır (Əshabımdır)".***

661 - أَخْبَرَنِي عِصْمَةُ بْنُ عَاصِمٍ، قَالَ: ثَنَا حَنْبَلٌ، قَالَ: سَمِعْتُ أَبَا عَبْدِ اللَّهِ وَسُئِلَ: مَنْ أَفْضَلُ: مُعَاوِيَةُ أَوْ عُمَرُ بْنُ عَبْدِ الْعَزِيزِ؟ قَالَ: «مَنْ رَأَى رَسُولَ

اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ» ، وَقَالَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ: «خَيْرُ النَّاسِ قَرْنِي»

İmam Əhməddən soruşuldu ki, kim daha üstündür? Muaviyyə yoxsa Ömər ibn Əbduləziz?

İmam Əhməd cavab verdi: Rasulullah - sallallahu aleyhi və səlləmi görən (Muaviyyə), Rasulullah - sallallahu aleyhi və səlləm dedi: *"**İnsanlarin ən xeyirlisi mənim əsrimdə yaşayan (Əshabımın) insanlarıdır**"*. *(Sünən əl Xəllal, 657-661)*

**Fayda:** İmam Zəhəbi Əbu Əbdurrahmən Əl Cobri haqqında yazır:

فما أحدثك، حتى أدري مذهبك في معاوية. فقلت: صاحب رسول الله ﷺ، وترحمت عليه،

"O, tələbələrinə onlardan Muaviyyə haqqındakı məzhəblərini (görüşlərini) soruşmadıqca hədis rəvayət etməzdi. Əgər onlar, O (Muaviyyə) Peyğəmbərin (s.a.s) səhabəsidir desə və onun (Muaviyyə) üçün dua etsəydilər (Əbu Əbdurrahmən bu halda hədis rəvayət edərdi)". *(Siyər Aləm ən-Nubəla 17/415)*

## Dəlil 10: Aişə (r.a) Allahdan Muaviyyəni (r.a) ömrünü onun ömrünə çatdırmasını təmənni etmişdir

Aişə (r.a) dedi:

**ما زال بي ما رأيت من امر الناس فى الفتنة حتى اني لأتمنى ان يزيد الله عزوجل معاوية من عمري في عمره**

"Fitnə zamanı insanların məsələlərini görəndə, Allah-

dan Muaviyyənin ömrünü mənim ömrümə çatdırmasını təmənni etdim". *(Ət Təbəqat, İbni Aruba Əl Hərrani, səh 41)*

**Dəlil 11: Sad ibn Əbu Vəqqas (r.a) Osmandan (r.a) sonra Muaviyyədən (r.a) daha yaxşı idarəçi olmadığını söyləmişdir**

Sad ibni Əbu Vəqqas dedi:

مَا رَأَيْتُ أَحَداً بَعْدَ عُثْمَانَ أَقْضَى بِحَقٍّ مِنْ صَاحِبِ هَذَا البَابِ -يَعْنِي: مُعَاوِيَةَ

"Osmandan (r.a) sonra Muaviyyədən (r.a) başqa haqqa görə daha yaxşı idarə edən bir kimsə görmədim". *(İbni Əsakir, Tarixi Diməşq 59/161, Hafiz Əbu Yəhya Nurpuri hədisi mötəbər saymışdır)*

**Dəlil 12: Əbu Dərda (r.a) Muaviyyənin (r.a) namazda Rasulullaha (s.a.s) ən çox bənzəyən şəxs olduğunu söyləmişdir**

Əbu Dərda dedi:

مَا رَأَيْتُ أَحَدًا بَعْدَ رَسُولِ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ ، أَشْبَهَ صَلاةً بِرَسُولِ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ ، مِنْ أَمِيرِكُمْ هَذَا ، يَعْنِي

"Namazında peyğəmbərə - sallallahu aleyhi va səlləm - sizin bu əmirinizdən - yəni Muaviyyədən - çox oxşayan başqa heç kimsəni görmədim". *(Əl Heysəmi, Məcməuz Zəvaid 4/285-də dedi: "Təbərani tərəfindən rəvayət edilmişdir və Qeys İbni Haris əl Münhəcidən başqa ricalları səhihin ricallarıdır və o siqədir")*

**Dəlil 13: İbn Abbas İsra surəsi 33-ün Muaviyyənin (r.a) idarəçiliyi ələ alması kimi anlamışdır, çünki O, Osmanın (r.a) varisi idi**

Uca Allah İsra surəsinin 33-cü ayətində: ***"Kim haqsız yerə öldürülmüşsə, artıq onun varisinə ixtiyar vermişik (istəsə bağışlayar, istəsə qisas tələb edər, istəsə də qanbahası alar)"*** buyurmaqdadır.

İbni Kəsir bu ayətin təfsirində buyurur: "Böyük alim və İmam İbni Abbas bu ayətin ümümi mənasından Muaviyyənin haqsız şəkildə qətl edilən Osmanın (r.a) varisi olması səbəbindən iqtidarı ələ alacağını anlamışdır.
Nəticədə, Muaviyyə İbni Abbasın bu ayətin əsasında dediyi kimi, İqtidarı ələ aldı. Bu, məsələlərin qəribə olanlarından biridir". *(İbni Abbasın bu ifadəsi Təbəraninin Mücəm Əl Kəbirində 10/320-də zikr edilmişdir)*

**Dəlil 14: Hz.Muaviyyənin (r.a) və Aişənin (r.a) Nəbəvi Hədisə olan sevgisi**

Muaviyyə (r.a) Aişəyə (r.a) məktub yazıb ondan məsləhət alardı və Hz.Aişədə (r.a) ona Rasulullahın (s.a.s) hədislərindən sitat gətirərdi.

"Muaviyyə Aişəyə məktub yazıb, mənə məsləhət ver və mənə ağır bir şey yükləmə" dedi. Bu səbəbdən Hz.Aişə Muaviyyəyə yazdı". Sənə salam olsun. İzləyəcəyin xüsuslara gəlincə, Rasulullahın (s.a.s) belə dediyini eşitdim: ***"Hər kim Allahın rızasını insan-***

***ların qəzəbindən üstün tutarsa, Allahda insanlarla əlaqələrində ona kifayət edər. Hər kimdə insanların rizayətini Allahın qəzəbinə tərcih edərsə, Allah da onu insanlara həvalə edər..vəs-salam".*** *(Sünən Tirmizi no: 2414)*

Bu Muaviyyənin (r.a) və Hz.Aişənin (r.a) Nəbəvi hədisə olan sevgisinə dəlildir.

**Dəlil 15: Rasulullahın (s.a.s) Hz.Muaviyyənin (r.a) ailəsinə olan sevgisi**

"Hz.Aişə nəql edir: (Muaviyyənin anası) Hind binti Utbə Rasulullaha (s.a.s) gəldi və dedi: "Ya Rasulullah (s.a.s), (İslamdan əvvəl) heç bir ailənin zəlil olması mənə sənin ailənin zəlil olmasından daha sevimli gəlməzdi. Bu gün isə yer üzündə heç bir ailənin izzətli olması sənin ailənin izzətli olmasından daha sevimli gəlmir. Rasulullah (s.a.s): *"Varlığım qüdrət əlində olan Allaha and olsun ki, məndə eyni qənaətdəyəm"* dedi. *(Səhih əl-Buxari 3825)*

İbni Həcər deyir ki: "Bu hədistə Hindin zəkasının yüksəkliyinə və bunu danışığında ustaca ifadə etməsində bir işarə vardır". *(Fəthul-Bari, c. 8, s. 142)*

İmam İbni Kəsir *"Əl Bidayə vən-Nihayə"*də yazır: "Məndə eyni qənaətdəyəm" sözündə (Hindin və Muaviyyənin ailəsi) üçün tərif vardır. Çünki Rasulullah (s.a.s) (İslamdan əvvəl) Hindi, ailəsini və digər küfrdə olanların zəlil olmasını istərdi, lakin onlar

İslama keçincə Rasulullah (s.a.s) onları (onun ailəsini) Allahın izzətləndirməsini istədi, bu səbəbdən Allah da onları izzətləndirdi, (yəni Hindin ailəsini). *(Əl Bidayə vən Nihayə 8/162)*

İbni Həcər kimi digər bəzi üləmada bu hədis haqqında dedi ki, bu hədisin anlamı hərfən alınmamalıdır, çünki (İslamdan öncə) Hind bin Utbədən (r.a) daha qatı İslam düşmənləri var idi və İslamı qəbul etdikdən sonra da Hind bin Utbədən (r.a) daha xeyirliləri vardı. *(Fəthul Bari)*

## Dəlil 16: Muaviyyə (r.a), Rasulullahın(s.a.s) bərbəri idi

Muaviyyə nəql etdi: "Uzun bir bıçaqla (qayçıyla) Rasulullahın (s.a.s) saçını kəsdim". *(Səhih Əl-Buxari 1730)*

İbni Abbasa Muaviyyənin bu hədisi haqqında sual edildiyində o dedi:

مَا كَانَ مُعَاوِيَةُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُتَّهَمًا "

"Muaviyyə Rasulullah (s.a.s) üzərinə (barəsində) yalan söyləməz". *(Müsnəd Əhməd 16863, Şeyx Şuayb Ərnəut dedi ki, hədis səhihdir)*

## Dəlil 17: Muaviyyə (r.a) suallarına Hz.Əlidən (r.a) və digər səhabədən cavab alardı

**a)** "Malik mənə Yəhya ibni Səiddən o da Səid ibni Əl Museyyəbdən nəql etdi ki, İbni Xeybəri adlı bir Suri-

yalı (başqa) bir adamı (özünün) xanımıyla tapıb öldürdü, yaxud hər ikisini öldürdü. Muaviyyə ibni Əbu Sufyan bu məsələdə qərar verməkdə çətinlik çəkdi və Əbu Musa Əl Əşariyə yazaraq bu barədə Əli ibni Əbu Talibdən soruşmasını istədi. Musa bu barədə Əlidən soruşdu və Əli (r.a) dedi: "Bu hadisə mənim ərazimdəmi baş vermişdir? Səni and verirəm ki, bunu mənə söyləməlisən". Əbu Musa, Muaviyyənin ona yazaraq bu məsələ barəsində Əlidən soruşmağını istədiyini izah etdi". Əli (r.a) dedi: "Mən Əbul Həsənəm, əgər o 4 şahid gətirəməzsə onu (öldürdüyü adamın qohumlarına) təslim edin". *(Muvatta İmam Malik kitab 36, Hədis 18)*

**b)** Muaviyyə (r.a) Zeyd ibni Sabitə (r.a) bir məsələ haqqında sual soruşdu və o da ona cavabən bu məktubu yazdı: "Rahmən və Rahim olan Allahın adıyla. Zeyd ibni Sabitdən Allahın qulu, Əmirəl Möminin Muaviyyəyə. Salam və Allahın rəhməti üzərinə olsun Ey, Əmirəlmöminin. Özündən başqa ilah olmayan Allaha sənin üçün dua edirəm.
Bundan sonra mənə baba və qardaşlar (haqqında) olan mirasdan bəhs etdin (və Muaviyyənin yazdığı məktubu zikr edir). Bütün işlərimizdə Allahın rəhbər olmasını, qorumasını və səbatını istəyirik.
Yanlış yönləndirən, bilgisiz və haqqında elmi olmadan danışmaqdan Allaha sığınırıq. Salam, Allahın bərəkəti, rəhməti və məğrifəti üzərinə olsun, Ey Əmirəl Möminin. (Tarix olaraq) Vuhayb onun üzərinə

nə cümə axşamı, Ramazanın 20-si, 42 H yazmışdı”. *(İsnad : Həsəndir (Əl-Əlbani) Əl-Ədəb Əl-Mufrəd 1131)*

## Dəlil 18: Muaviyyə (r.a) Hz.Əlinin(r.a) özündən üstün olduğunu bilirdi və bu məsələdə cahil deyildi

**a)** İbni Həcər əl Əsqalani yazır:

وقد ذكر يحيى بن سليمان الجعفي أحد شيوخ البخاري في " كتاب صفين " في تأليفه بسند جيد عن أبي مسلم الخولاني أنه قال لمعاوية : أنت تنازع عليا في الخلافة أو أنت مثله ؟ قال : لا ، وإني لأعلم أنه أفضل مني وأحق بالأمر ، ولكن ألستم تعلمون أن عثمان قتل مظلوما وأنا ابن عمه ووليه أطلب بدمه ؟ فأتوا عليا فقولوا له يدفع لنا قتلة عثمان ، فأتوه فكلموه فقال : يدخل في البيعة ويحاكمهم إلي ،

“İmam Buxarinin müəllimlərindən olan Yəhya ibni Süleyman Əl Cafi *“Kitab əs Siffin”* kitabında güclü isnad ilə Əbu Muslim Əl Xolanidən nəql etdi ki, O Muaviyyədən soruşdu: ”Sən, Əliylə xilafət barəsində mübahisə edir yaxud özünü ona bərabərmi görürsən ?” o dedi: ”Vallahi, xeyr. Mən onun məndən daha üstün olduğunu və idarəçiliyə haqqı olduğunu bilirəm”. Lakin, siz bilmirsinizmi ki, Osman məzlum olaraq öldürüldü? Mən onun xalaoğlusu və qanını axtaranam. Bu səbəbdən, Əliyə get və mənə Osman-ın qatillərini göndərməsini söylə, (O bunu etdikdən) sonra ona beyət edəcəyəm. Onlar,Əliyə getdilər və onunla danışdılar. Əli (r.a) dedi: ”İlk öncə mənə bey-ət et və sonra bu barədə soruş”. *(Fəth əl Bari (13/ 92))*

**b)** İmam Zəhəbi digər bir isnad ilə *”Siyər”* kitabında

Buxarinin müəllimindən sitat gətirməkdədir:

قَالَ الجُعْفِيُّ: حَدَّثَنَا يَعْلَى بنُ عُبَيْدٍ، عَنْ أَبِيْهِ، قَالَ:

جَاءَ أَبُو مُسْلِمٍ الخَوْلاَنِيُّ وَأُنَاسٌ إِلَى مُعَاوِيَةَ، وَقَالُوا: أَنْتَ تُنَازِعُ عَلِيّاً، أَمْ أَنْتَ مِثْلُهُ؟

فَقَالَ: لاَ وَاللهِ، إِنِّيْ لأَعْلَمُ أَنَّهُ أَفْضَلُ مِنِّي، وَأَحَقُّ بِالأَمْرِ مِنِّي، وَلَكِنْ أَلَسْتُم تَعْلَمُوْنَ أَنَّ عُثْمَانَ قُتِلَ مَظْلُوْماً، وَأَنَا ابْنُ عَمِّهِ، وَالطَّالِبُ بِدَمِهِ، فَائْتُوْهُ، فَقُوْلُوا لَهُ، فَلْيَدْفَعْ إِلَيَّ قَتَلَةَ عُثْمَانَ، وَأُسْلِمَ لَهُ.

فَأَتَوْا عَلِيّاً، فَكَلَّمُوْهُ، فَلَمْ يَدْفَعْهُم إِلَيْهِ

"Əbu Muslim Xolani və digərləri Muaviyyəyə gedərək ondan soruşdular: "Əliylə Mübahisə edir yaxud özünü ona bərabərmi görürsən?
Muaviyyə dedi: "Vallahi, xeyr. Mən onun məndən daha üstün olduğunu və idarəçiliyə haqqı olduğunu bilirəm". Lakin, siz bilmirsinizmi ki, Osman məzlum olaraq öldürüldü? Mən onun xalaoğlusu və qanını axtaranam. Bu səbəbdən, Əliyə get və mənə Osmanın qatillərini göndərməsini söylə, (O bunu etdikdən) sonra ona beyət edəcəyəm". Onlar Əliyə getdilər və Onunla danışdılar. Lakin Əli (r.a) Osmanın (r.a) qatillərini təslim etməyi rədd etdi". *(Siyər aləm Ən Nubəla, cild 3, səh 140. Kitabın Mühəqqiqi dedi:*رجاله ثقات *- ricalları siqədir, Həmçinin İmam İbni Kəsir bu rəvayəti Əl Bidayəsində 8/129-da zikr etmişdir)*

**c)** İmam İbni Əsakir digər isnadla nəql edir:

ونا إبراهيم نا يحيى قال حدثني يعلى بن عبيد الحنفي نا أبي قال جاء أبو مسلم الخولاني وأناس معه إلى معاوية فقالوا له أنت تنازع عليا أم أنت مثله فقال

معاوية لا والله إني لأعلم أن عليا أفضل مني وأنه لأحق بالأمر مني ولكن ألستم تعلمون أن عثمان قتل مظلوما وأنا ابن عمه وإنما أطلب بدم عثمان فائتوه فقولوا له فليدفع إلي قتلة عثمان وأسلم له فأتوا عليا فكلموه بذلك فلم يدفعهم إليه

"Əbu Muslim Xolani və digərləri Muaviyyəyə gedərək ondan soruşdular: "Əliylə Mübahisə edir yaxud özünü ona bərabərmi görürsən?
Muaviyyə dedi: "Vallahi, xeyr. Mən onun məndən daha üstün olduğunu və idarəçiliyə haqqı olduğunu bilirəm". Lakin, siz bilmirsinizmi ki, Osman məzlum olaraq öldürüldü? Mən onun xalaoğlusu və qanını axtaranam. Bu səbəbdən, Əliyə get və mənə Osmanın qatillərini göndərməsini söylə, (O bunu etdikdən) sonra ona beyət edəcəyəm". Onlar Əliyə getdilər və Onunla danışdılar. Lakin Əli (r.a) Osmanın (r.a) qatillərini təslim etməyi rədd etdi". *(Tarixi Diməşq, 59/ 132, Muaviyyə ibni Sufyanın tərcüməsinin aşağısında )*

**d)** İmam Əhməd *"Kitab zz-Zühd"*-də yazır:

حَدَّثَنَا عَبْدُ اللَّهِ، حَدَّثَنَا أَبُو شِبْلٍ مُحَمَّدُ بْنُ هَارُونَ حَدَّثَنَا حَسَنُ بْنُ وَاقِعٍ، حَدَّثَنَا ضَمْرَةُ، عَنْ عَلِيِّ بْنِ أَبِي حَمْلَةَ، عَنْ أَبِيهِ، قَالَ: رَأَيْتُ مُعَاوِيَةَ عَلَى الْمِنْبَرِ بِدِمَشْقَ يَخْطُبُ النَّاسَ وَعَلَيْهِ قَمِيصٌ مَرْقُوعٌ "

"Əbu Həmlə dedi: "Muaviyyəni minbər üzərində insanlara xütbə verərkən gördüm, köynəyi digər paltarla yamalı idi". *(əz-Zuhd no. 965)*

**e)** İmam İbni Əsakir nəql edir: "Mən sizdən daha xeyirli deyiləm və aranızda məndən daha xeyirli olan Abdullah ibni Ömər və Abdullah ibni Amr kimi di-

digər fəzilətli olanlar vardır. Bəlkədə mən sizin düşmənlərinizi öldürməkdə sizdən daha xeyirliyəm”. *(Tarix Diməşq İbn Əsakir 59/163; İbn Sa`d, Təbaqat əl Kubra, 1/116)*

## Dəlil 19: Muaviyyənin (r.a) cənnətlik olduğu söylənmişdir:

İmam əl-Buxari *“əs-Səhih”*də Ummu Haram əl-Ənsari’dən - radiyallahu anhu - onun peyğəmbərdən - sallallahu aleyhi va səlləm - belə dediyini eşitdiyini rəvayət edir: ***“Ümmətimdən dənizdə döyüşən ilk orduya (Allah cənnəti) vacib etmişdir.” Ummu Haram dedi: “Ey Allahın Elçisi! Mən onların arasında olacammı?” Dedi: “Sən onların arasındasan.” Sonra peyğəmbər - salləllahu aleyhi va səlləm - dedi: “Ümmətimdən Qeysar’ın şəhərində ilk vuruşan ordunun günahları bağışlanmışdır.” Soruşdu: “Ey Allahın Elçisi! Mən onların arasındayammı?” Dedi: “Xeyr!*** *(“əs-Səhih”, (6/102; “Fəthul-Bari”dəki rəqəmə əsasən 2924))*

**Hz.Muaviyyənin (r.a) ilklərdən olduğunun dəlili:** Ümmü Həram dedi:

فَقَالَتْ : ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ ، فَقَالَ : أَنْتِ مِنْ الْأَوَّلِينَ ؛ فَخَرَجَت مَعَ زَوْجِهَا عُبَادَةَ بْنِ الصَّامِتِ غَازِيًا أَوَّل مَا رَكِبَ الْمُسْلِمُونَ الْبَحْرَ مَعَ مُعَاوِيَةَ

“(Ey Allahın Elçisi), dua edin məndə onlardan olum”. (Rasulullah (s.a.s)) dedi: ”Sən onlardansan”. Sonra (söylənilən) oldu və O, Cihada gedən həyat yoldaşı Übedə ibn Samitlə (qəzaya) getdi. Bu Mua-

viyyənin komandirliyi altında Müsəlmanların ilk qəzavatı (savaşı) idi". *( Səhih əl-Buxari 2799)*

İmam İbni Həcər əl Əsqalani dedi:

وقوله : قد أوجبوا " أي فعلوا فعلا وجبت لهم به الجنة .

"Vacibdir ifadəsi ... (Yəni) cənnət onlara vacibdir deməkdir". *(Fəthul Bari, həmin hədisin şərhində)*

İmam İbni Əbdulbərr deyir:

**" وفيه فضل لمعاوية رحمه الله إذ جعل من غزا تحت رايته من الأولين ورؤيا الأنبياء صلوات الله عليهم وحي "**

"Bu hədisdə Muaviyyə radiyallahu anh-ın fəzilətinə dair dəlil vardır". *(ət-Təmhid 1/235)*

əl-Hafiz İbn Həcər və əl-Hafiz əl-Bədr əl-Ayni *"əs-Səhih"*ə yazdıqları şəhrlərində əl-Muləhhəb bin Sufra əl-Əndəlusi'dən ( vəfatı: hicri 435) belə dediyini nəql edirlər: "Bu hədisdə Muaviyyə üçün bir fəzilət var, çünki dənizdə döyüşən ilk kəs o, olmuşdur". *(İbn Həcər, "Fəthul-Bari", 6/120)*

əl-Firyəbi deyir: "Dənizdə ilk döyüşən Muaviyyə olmuşdur. Osman bin Affan'ın zamanında döyüşmüşdür." *(əl-Əcurri, "əş-Şəria", 5/2441 (rəq: 1922))*

əl-Hafiz İbn Abdilbərr - rahiməhullah - deyir: "Bu babdakı hədisdə zikr olunan döyüşün Muaviyyənin döyüşü olmasında bildiyim qədər ilə tarix alimlərindən heç kəs ixtilaf etməmişdir, çünki Ummu Haram

onunla birlikdə döyüşdə olmuşdur və bu, Osmanın xilafəsində olmuşdur.” Əhli-sünnət imamlarından əl -Əcurri, əl-Laləkay, İbn Abdilbərr və başqaları bu hədisi Muaviyə üçün bir fəzilət hesab edirlər. *(“ət-Təmhid”, 1/242)*

## Dəlil 20: Muaviyyə (r.a) Əbdul Rahmən ibn Şibala (r.a) insanlara Hədis öyrətməsini əmr etmişdir

كَتَبَ مُعَاوِيَةُ إِلَى عَبْدِ الرَّحْمَنِ بْنِ شِبْلٍ أَنْ عَلِّمِ النَّاسَ مَا سَمِعْتَ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ، فَجَمَعَهُمْ، فَقَالَ: إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ: " تَعَلَّمُوا الْقُرْآنَ، فَإِذَا عَلِمْتُمُوهُ، فَلَا تَغْلُوا فِيهِ ، وَلَا تَجْفُوا عَنْهُ، وَلَا تَأْكُلُوا بِهِ، وَلَا تَسْتَكْثِرُوا بِهِ "

“Muaviyyə (r.a) Əbdurrahmən ibni Şibala (r.a) yazaraq Rasulullahdan (s.a.s) eşitdiklərini insanlara öyrətməsini istədi. Bu səbəbdən o dedi: ”Rasulullahın ( s.a.s) belə dediyini eşitdim: ***”Qur’anı oxuyub öyrənin ”***. *(Müsnəd Imam Əhməd 24/437, Şeyx Şuayb Ərnəvut Müsnədin təhqiqində hədisi mötəbər saymışdır, Siyər Al-əm ən Nübəlanın Mühəqqiqi 7/15 dedi: Hafız İbni Həcərin ”əl Fəthul Baridə” dediyi kimi isnadı güclüdür)*

## Dəlil 21: Muaviyyənin (r.a) olduqca gözəl sirəsi vardı

حَدَّثَنَا عِيسَى بْنُ مُحَمَّدٍ الرَّمْلِيُّ، وَابْنُ، عَوْفٍ - وَهَذَا لَفْظُهُ - قَالاَ حَدَّثَنَا الْفِرْيَابِيُّ، عَنْ سُفْيَانَ، عَنْ ثَوْرٍ، عَنْ رَاشِدِ بْنِ سَعْدٍ، عَنْ مُعَاوِيَةَ، قَالَ سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ " إِنَّكَ إِنِ اتَّبَعْتَ عَوْرَاتِ النَّاسِ أَفْسَدْتَهُمْ أَوْ كِدْتَ أَنْ تُفْسِدَهُمْ " . فَقَالَ أَبُو الدَّرْدَاءِ كَلِمَةٌ سَمِعَهَا مُعَاوِيَةُ مِنْ رَسُولِ اللَّهِ ﷺ نَفَعَهُ اللَّهُ تَعَالَى بِهَا .

Muaviyyə (r.a) nəql etdi ki, Rasulullahın (s.a.s) belə

dediyini eşitdim: ***"Şayət sən insanların qüsurunu araştıracaq olsan ya onları ifsad etmiş olarsan və yaxud ifsad etməyə yaxınlaşarsan".*** Əbu Dərda dedi: "Bu Muaviyyənin özünün Rasulullahdan (s.a.s) eşitdiyi sözlərdir və Allahda onu onlarla faydalandırdı". *(Sunən Əbi Davud 4888)*

İmam İbni Kəsir yazır:

يعني: أنه كان جيد السيرة، حسن التجاوز، جميل العفو، كثير الستر رحمه الله تعالى

"Yəni: Onun olduqca gözəl sirəsi (davranışları) vardı, insanları gözəl şəkildə məzur görərdi, onları gözəl şəkildə bağışlardı və bir çox qüsurlarını örtərdi. Allah ona rəhmət etsin". *(Əl Bidayə vən Nihayə 8/166)*

## Dəlil 22: Ümmül Möminin Ümmü Həbibənin Muaviyyə (r.a) üçün dua etməsi

Abdullah ibn Məs`ûd deyir ki: Rasulullahın (s.a.s) xanımı Ümmü Həbibə dedi: "Allahım! Mənə ərim Rasulullahı, atam Əbu Sufyanı və qardaşım Muaviyyəni bağışla (Məni onlarla uzun yaşat)".

Bunun üzərinə Rasulullah sallallahu aleyhi vəsəlləm (Nə üçün Muaviyyə üçün dua etdin deyildə əvəzinə): "Sən Allah'dan təqdir edilmiş əcəlləri, sayılmış günləri və təqsim edilmiş ruziləri istədin. O heç bir şeyi vaxtı gəlmədən yaradacaq yaxud bir şeyi

vaxtından sonraya buraxacaq deyildir. Şayət Allah-dan səni cəhənnəmin əzabından vəya qəbir əzabından qorumasını istəsəydin daha xeyirli və daha əfdal olardı" buyurdular. *(Səhih Muslim Hədis 6438)*

## Dəlil 23: Tabeindən Əbu İshaq əs-Səbi Muaviyyə-dən (r.a) sonra onun kimisini görməmiş olmasını söyləməsi

Əbu İshaq əs Səbi dedi:

كان معاوية، وما رأينا بعده مثله

"Muaviyyədən sonra onun kimisini görmədim". *(Sünnə əl Xəllal, (2/438), İbni Əsakir, Tarixi Diməşq (59/171), Sünnə əl Xəllal Mühəqqiqi dedi ki, isnadı səhihdir)*

## Dəlil 24: Rasulullahın (s.a.s) Hz.Muaviyyəyə (r.a) Nəsihəti:

İmam Əhməd (r.a) nəql edir:

حَدَّثَنَا رَوْحٌ ، قَالَ : حَدَّثَنَا أَبُو أُمَيَّةَ عَمْرُو بْنُ يَحْيَى بْنِ سَعِيدٍ ، قَالَ : سَمِعْتُ جَدِّي يُحَدِّثُ ، أَنَّ مُعَاوِيَةَ أَخَذَ الْإِدَاوَةَ بَعْدَ أَبِي هُرَيْرَةَ يَتْبَعُ رَسُولَ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ بِهَا ، وَاشْتَكَى أَبُو هُرَيْرَةَ ، فَبَيْنَا هُوَ يُوَضِّئُ رَسُولَ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ رَفَعَ رَأْسَهُ إِلَيْهِ مَرَّةً ، أَوْ مَرَّتَيْنِ وَهُو يَتَوَضأ ، فَقَالَ : " يَا مُعَاوِيَةُ إِنْ وُلِّيتَ أَمْرًا فَاتَّقِ اللَّهَ عَزَّ وَجَلَّ ، وَاعْدِلْ " ، قَالَ : فَمَا زِلْتُ أَظُنُّ أَنِّي مُبْتَلًى بِعَمَلٍ لِقَوْلِ النَّبِيِّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى ابْتُلِيتُ .

"Muaviyyə Əbu Hureyrədən sonra konteynerdən ( su dolu qabdan) su aldı (ki, Rasulullah (s.a.s) abdəst alsın) və Rasulullahın (s.a.s) arxasınca getdi.

Əbu Hureyrə (r.a) xəstə idi. Rasulullah (s.a.s) abdəst alarkən, Muaviyyəni bir yaxud iki dəfə gördü və dedi: ***"Ey Muaviyyə, hakim olduğun zaman Allahdan qorx və adil ol".*** Muaviyyə dedi: "Rasulullahın (s.a.s) bu sözünə görə hər zaman imtahan edilənə qədər imtahan ediləcəyimi düşündüm" (idarəçi oldum və imtahan edilim). *(Müsnəd Əhməd)*

**a)** İmam əl Heysəmi (r.a) dedi:

رَوَاهُ أَحْمَدُ وَاللَّفْظُ لَهُ، وَهُوَ مُرْسَلٌ، وَرَوَاهُ أَبُو يَعْلَى فَوَصَلَهُ فَقَالَ فِيهِ: عَنْ مُعَاوِيَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ - صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ -: «تَوَضَّؤُوا ". قَالَ: فَلَمَّا تَوَضَّؤُوا نَظَرَ إِلَيَّ فَقَالَ: " يَا مُعَاوِيَةُ، إِنْ وُلِّيتَ أَمْرًا فَاتَّقِ اللَّهَ وَاعْدِلْ». وَالْبَاقِي بِنَحْوِهِ. وَرَوَاهُ الطَّبَرَانِيُّ فِي الْأَوْسَطِ وَالْكَبِيرِ، وَقَالَ فِي الْأَوْسَطِ: " فَاقْبَلْ مِنْ مُحْسِنِهِمْ وَتَجَاوَزْ عَنْ مُسِيئِهِمْ ". بِاخْتِصَارٍ. وَرِجَالُ أَحْمَدَ وَأَبِي يَعْلَى رِجَالُ الصَّحِيحِ.

"İmam Əhməd tərəfindən mürsəl isnadla, Əbu Yəla tərəfindən isə (Mosula) bağılı olan isnad yoluyla nəql edilmişdir... Əhmədin və Əbu Yəlanın raviləri səhihin raviləridir". *(Məcmuə əz-Zəvaid (9/356))*

**b)** İmam Zəhəbi deyir:

ولهذا طرق مقاربة

"Onun bir çox müqərib (qəbul görən) (isnadları) vardır". *(Siyər A`ləm ən-Nubəla 3/131)*

**c)** *"Siyər Aləm ən Nubəla"*nın Mühəqqiqi dedi:

رجاله ثقات، وهو في " المسند " 4 / 101، وانظر " البداية " 8 / 123.

"Ricalları siqədir, Və o *"əl Müsnəd 4/101"* və *"əl Bida-*

*yədə 8/123"* (nəql edilmişdir)".

**d)** İmam Beyhəqi bu hədisin isnadı haqqında deyir: "İsmail ibni İbrahim zəifdir, lakin hədisin (Müsnəddə və Əbu Yəla'da) digər şahidləri vardır. *(Dəlail ən-Nübüvvə 2/446, İbn Kəsir Beyhəqinin bu sözlərini əl Bidayə vən Nihayədə 8/123-təsdiq edir)*

Qeyd edim ki, bu hədis bir çox məsələni özündə ehtiva etməkdədir:

**1)** Muaviyyə (r.a) Rasulullaha (s.a.s) abdəst almaqda kömək edir

**2)** Muaviyyə (r.a) Rasulullahı (s.a.s) sevməkdədir

**3)** Rasulullah (s.a.s) Muaviyyəyə (r.a) nəsihət etmişdi və Muaviyyənin (r.a) imanı gözəl idi. O bilirdi ki, imtahan olunacaq, çünki Rasulullah (s.a.s) ona nəsihət etmişdir

## Dəlil 25: Cəfər əs-Sadiqin (r.a) Muaviyyənin (a.a) təriflǝndiyi hədisləri qəbul etməsi

İmam İbni Əsakir, Beyhəqinin isnadıyla nəql edir: "Cəfər ibni Muhəmməd (Əs Sadiq) Qasım ibni Muhəmməd ibni Əbu Bəkr əs Siddiqdən nəql etdi ki, o dedi: "Muaviyyə ibni Əbu Sufyan dedi: Rasulullah ( s.a.s) buyurdu: ***"Əgər imam oturaraq namazı qıldırarsa, onun arxasındakı insanlarda oturaraq namaza başlamalıdırlar".*** Qasım dedi: "İnsanlar (Səhabə və Tabein) Muaviyyənin doğruluğuna heyran qaldılar".

Əl Beyhəqi dedi: "(Əhl'i beytdən) Cəfər ibni Muhəmməd əs sadiq Qasım ibni Muhəmməd ibni Əbu Bəkr əs Siddiqdən nəql etmişdir və onun (Qasımın) insanlardan Muaviyyənin doğruluğunu təsdiqlədiyi rəvayəti təsdiq etmişdir", və o insanlar sağ qalan Səhabələr və Tabeinin böyükləri idi". *(Tarix Diməşq 59/166, Muaviyyənin bu hədisi və Qasımın sözləri İbni Əbu Şeybədə və Təbəranidə də zikr edilmişdir, Əlbani "əs-Səhihə" sində 1363 hədisi səhih saymışdır, Şeyx Zübeyr Əli də " Fədail əs Səhabə" təhqiqində "Muaviyyə ibni Əbu Sufyan" bölməsində "Tarixi Diməşq"dəki hədisi sitat gətirmiş və hədisi mötəbər saymışdır)*

## Dəlil 26: Muaviyyənin (r.a) fəziləti haqqında kitab yazan alimlər

**1.** İbni Əbi Dünya (v.208 H) : *"Hilmu Muaviyyə "* الكتاب: حلم معاوية لابن أبي الدنيا -İmam İbni Əsakir öz *"Tarix"* kitabında bu kitabdan sitatlar gətirməkdədir

**2.** İmam İbni Asim öz kitabında Hz.Muaviyyə üçün ayrı bir cüzz açmışdır *(Fəthul Bari, "Zikrul Muaviyyə " bölümü)*

**3.** Əbu Ömər Ğulam Sələb (v.345 H) Hz.Muaviyyə haqqında kitab yazmışdır *(Fəthul Bari, "Zikrul Muaviyyə" bölümünün altında)*

İmam Zəhəbi yazır:

جمع فيه فضائل معاوية، فكان لا يترك واحدا منهم يقرأ عليه شيئا حتى يبتدئ بقراءة ذلك الجزء

"O (Əbu Ömər Ğulam Sələb) Muaviyyənin (r.a) fəzilətlərinə dair bir kitab yazdı, tələbələri bu kitabı oxumayıncaya qədər onları öyrətməzdi". *(Siyər A`ləm ən-Nubəla 15/510, Tarixi Bağdad 2/356-357)*

**4.** Əbu Bəkr Ən Nəqqaş *"Mənaqib"*ində bir cüzz ayırmışdır. *(Fəthul Bari, "Zikrul Muaviyyə" bölümünün altında)*

**5.** Əbul Fəttah ibni Əbu Əl Fəvaris (v.412 h) bu barədə kitab yazmışdır. *(Minhac əs-Sünnə 4.84)*

**6.** Əli ibni Əl Həsən Əl Qəzvini *"Fədail Muaviyyə"* adlı kitab yazmışdır. *(Əbul Qasım ər Rifai əl Qəzvini, Tədvin fi Əxbər Əl Qəzvin 3/352)*

**7.** Ubeydullah əs Səqəti əl Bağdadi (v.406 H) *"Fəzail Əmirül Möminin Muaviyyə"* adlı kitab yazmışdır. Bu kitab günümüzə çatmışdır, lakin içində çox uydurma rəvayətlər vardır.

**8.** Əbu Əli Əl Hüseyn Əl Əhvəzi (v.446 h) *"Şərh Uqəd Əhlul İman fi Muaviyyə bin Əbu Sufyan və Zəkar Ma Vərad fil Əxbar min Fədail və Munaqib Radiyallahu anhu "* adlı kitab yazmışdır.

**9.** Əbul Fəth Yusif Əl Qəvvas Muaviyyənin (r.a) fəzilətlərinə dair kitab yazmışdır. *(Tarix Bağdad 16/476)*

10. Əbu Yəlada onun haqqında kitab yazmışdır və kitab bu adla nəşr edilmişdir:

نزيه خال المؤمنين معاوية بن أبي سفيان من الظلم والفسق في مطالبته بدم " أمير المؤمنين عثمان"

Burada sadaladaqlarımız sadəcə onun fəziləti haqqında yazılan kitablardan bir neçəsidir. Əgər bütün kitabları sadalarsaq onların sayı 100-ü keçər.

**<u>Bir Lətifə</u>:** Xətib Bağdadi deyir:

حدَّثَنِي تَمام بْن مُحَمَّد الهاشمي، وَمُحَمَّد بْن عَلِيّ بْن الفتح وغيرهما، أنهم سمعوا أَبَا الفتح يوسف القواس يذكر أَنَّهُ وجد فِي كتبه جزءًا لَهُ فِيهِ فضائل مُعَاوِيَة قد قرضته الفأرة، فدعا الله تعالى عَلَى الفأرة التي قَرَضته، فسقطت من السقف، ولَم تزل تضطرب حتى ماتت،

"Tamam ibni Muhəmməd əl Həşmi və Muhəmməd ibni Əli ibn Fəth və digərləri mənə nəql etdilər ki, onlar eşitdilər ki, Əbul Fəth Yusif əl Qəvvas zikr edir ki, o kitablarında Muaviyyənin fəzilətinə dair bir bölümün sıçovul tərəfindən gəmirilmiş olduğunu gördü, və o sıçovula bəddua etdi, sıçovul damdan düşdü və ölənə qədər izdirab içində qaldı".
*(Tarix Bağdad 16/476)*

## <u>Muaviyyə (r.a) əleyhinə olan bəzi iddialara cavab</u>

### <u>1) Əmmar ibni Yasirin qatilinin cəhənnəmə gedəcəyi iddiasına cavab:</u>

Hz.Muaviyyə düşmənləri *"Səhih Buxari"*dən bu hədisi gətirməkdələr. Bu səbəblə də Əmmarın (r.a) Hz. Muaviyyənin ordusu tərəfindən qətle dildiyini və

Hz.Muaviyyənin (r.a) cəhənnəm əhli olduğunu iddia etməkdədirlər ki, hədis belədir:

حدثنا مسدد قال حدثنا عبد العزيز بن مختار قال حدثنا خالد الحذاء عن عكرمة قال لي ابن عباس ولابنه علي انطلقا إلى أبي سعيد فاسمعا من حديثه فانطلقنا فإذا هو في حائط يصلحه فأخذ رداءه فاحتبى ثم أنشأ يحدثنا حتى أتى ذكر بناء المسجد فقال كنا نحمل لبنة لبنة وعمار لبنتين لبنتين فرآه النبي ﷺ فينفض التراب عنه ويقول ويح عمار تقتله الفئة الباغية يدعوهم إلى الجنة ويدعونه إلى النار قال يقول عمار أعوذ بالله من الفتن

İkrimə dedi: İbn Abbas (r.a) mənə və oğlu Əliyə dedi: Əbu Səid (əl-Xudrinin) yanına gedin və ondan hədis dinləyin. Biz onun yanına yollandıq. O, bağda abadlıq işləri ilə məşğul idi. (Bizi görəndə) ridasını topladı (bədəninə bürüdü). Sonra isə bizə hədis söylədi. Söhbət məscidin inşasına çatanda belə dedi: Biz kərpicləri bir-bir daşıyırdıq. Əmmar isə iki-iki daşıyırdı. Peyğəmbər (sallallahu aleyhi və əlih) onu (Əmmarı) görüb və üzərindəki torpağı silkələyib dedi: ***"Yazıq Əmmar! Onu azğın (və ya zalım) dəstə öldürəcəkdir. Əmmar onları cənnətə çağıracaq, onlar isə onu (cəhənnəm) oduna cağıracaqlar. Əmmar (bunları eşidib) deyirdi ki, fitnələrdən Allaha sığınıram".***

*Mənbə: (Səhih Buxari, Namaz kitabı, 63-cü bab hədis 436 /Səhih Buxari : cild 1, kitab 8, No 438)*

**Cavab:**

Alimlərin bu hədis barədə sözləri:

İmam ibni Həcər bu barədə yazır:

أنهم كانوا ظانين أنهم يدعون إلى الجنة، وهم مجتهدون لا لوم عليهم في

اتباع ظنونهم، فالمراد بالدعاء إلى الجنة الدعاء إلى سببها وهو طاعة الإمام، وكذلك كان عمار يدعوهم إلى طاعة علي وهو الإمام الواجب الطاعة إذ ذاك، وكانوا هم يدعون إلى خلاف ذلك لكنهم معذورون للتأويل الذي ظهر لهم

"Onlar, Cənnətə çağırdıqlarını zənn edirdilər. Müctəhid olduqları üçün zənnlərinə uymaları səbəbiylə ləvm edilməzlər (qınanmazlar). Cənnətə çağırmaqdan murad, onun səbəbinə çağırmaqdır. Bu da imama itaətdir. Necə ki, Hz.Əmmar onları Hz.Əliyə itaət etməyə çağırırdı. O vaxt itaət edilməsi vacib olan imam da Hz.Əli idi. Digərləridə bunun xilafına çağırış edirlərdi. Lakin, onlarda özlərinə zahir olan təvil səbəbindən məzur halda idilər". *(Fəthul Bari)*

İbn Teymiyyə deyir: "Üstəlik ***"Əmmarı üsyankarlar öldürəcək"*** hədisi bu ləfzin Muaviyyə və əshabına aid olmasında qəti deyildir, ola bilsin ki, bununla ona hücum edib onu öldürənlər qəsd olunmuşdur və onlar əskərlərdən bir qrupdur və kim Əmmar'ın öldürülməsinə razıdırsa onların da hökmü onu öldürənlərin hökmü kimidir. Məlumdur ki, əskərlər arasında Abdullah bin Amr bin əl-As və başqaları kimi Əmmar'ın ölümünə razı olmayanlar da var idi. Əksinə hamı Əmmar'ın öldürülməsini rədd edirdilər.
Hətta Muaviyyə və Amr belə bunu inkar edirdilər". *(İbn Teymiyyə, "Məcmu əl-Fətava", 35/76)*

əl-Hafiz İbn Kəsir - rahiməhullah - deyir:

وَلَا يَلْزَمُ مِنْ تَسْمِيَةِ أَصْحَابِ مُعَاوِيَةَ بُغَاةً : تَكْفِيرُهُمْ ، كَمَا يُحَاوِلُهُ جَهَلَةُ

الْفِرْقَةِ الضَّالَّةِ مِنَ الشِّيعَةِ وَغَيْرِهِمْ ; لِأَنَّهُمْ ، وَإِنْ كَانُوا بُغَاةً فِي نَفْسِ الْأَمْرِ، فَإِنَّهُمْ كَانُوا مُجْتَهِدِينَ فِيمَا تَعَاطَوْهُ مِنَ الْقِتَالِ، وَلَيْسَ كُلُّ مُجْتَهِدٍ مُصِيبًا، بَلِ الْمُصِيبُ لَهُ أَجْرَانِ، وَالْمُخْطِئُ لَهُ أَجْرٌ .

وَمَنْ زَادَ فِي هَذَا الْحَدِيثِ بَعْدَ قَوْلِهِ: " «تَقْتُلُكَ الْفِئَةُ الْبَاغِيَةُ» ": لَا أَنَالَهَا اللَّهُ شَفَاعَتِي يَوْمَ الْقِيَامَةِ، فَقَدِ افْتَرَى فِي هَذِهِ الزِّيَادَةِ عَلَى رَسُولِ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ; فَإِنَّهُ لَمْ يَقُلْهَا ؛ إِذْ لَمْ تُنْقَلْ مِنْ طَرِيقٍ تُقْبَلُ. وَاللَّهُ أَعْلَمُ.

وَأَمَّا قَوْلُهُ: «يَدْعُوهُمْ إِلَى الْجَنَّةِ، وَيَدْعُونَهُ إِلَى النَّارِ» : فَإِنَّ عَمَّارًا وَأَصْحَابَهُ يَدْعُونَ أَهْلَ الشَّامِ إِلَى الْأُلْفَةِ وَاجْتِمَاعِ الْكَلِمَةِ ، وَأَهْلُ الشَّامِ يُرِيدُونَ أَنْ يَسْتَأْثِرُوا بِالْأَمْرِ دُونَ مَنْ هُوَ أَحَقُّ بِهِ ، وَأَنْ يَكُونَ النَّاسُ أَوْزَاعًا عَلَى كُلِّ قُطْرٍ إِمَامٌ بِرَأْسِهِ ، وَهَذَا يُؤَدِّي إِلَى افْتِرَاقِ الْكَلِمَةِ ، وَاخْتِلَافِ الْأُمَّةِ، فَهُوَ لَازِمُ مَذْهَبِهِمْ وَنَاشِئٌ عَنْ مَسْلَكِهِمْ ، وَإِنْ كَانُوا لَا يَقْصِدُونَهُ. وَاللَّهُ أَعْلَمُ ".

“Bağilər adlanmaları, şiələrdən və başqalarından ibarət zəlalət firqələrinin cahillərinin iddia etdikləri kimi Muaviyyə və əshabının kafirlər olması anlamına gəlməz, çünki onlar bağilər olsalar da ictihad edərək vuruşmuşdular və hər müctəhid haqlı olmaz, əksinə haqlı olana iki əcr, xəta edənə isə bir əcr düşür. Kim hədisi ***“Əmmarı bağı bir qrup öldürəcək, Allah ona Qiyamət günü şəfaətimi qismət etməyəcək”*** şəklinə əlavə sözlə rəvayət edirsə, bu artıq sözlər ilə peyğəmbərə - sallallahu aleyhi va səlləm - iftira etmişdir, çünki o, belə bir şey deməmişdir. Beləki bu artıq sözlər məqbul bir kanalla rəvayət olunmamışdır. Doğrusunu Allah bilir! Lakin onun ***“O, onları cənnətə, onlar isə onu cəhənnəmə çağırırlar”*** sözlərinə gəldikdə isə, əlbəttə ki, Əmmar və onun adamları ülfətə, bir söz ətrafında birləşməyə çağırırdılar. Şam əhli isə idarəni ələ keçirmək istəyir və bunda kimin daha la-

yiq olduğuna əhəmiyyət vermirdilər və insanların ayrı-ayrı ölkələrdə bir arada olub hər birinin başında bir idarəçinin olmasını istəyirdilər. Belə bir şey isə fikirlərin ayrılmasına, ümmətin parçalanmasına gətirib çıxarır və bu, bunu qəsd etməsələr belə onların getdikləri məzhəbin nəticəsi idi və onların tutduqları yolun ortaya çıxardığı vəziyyəti idi.
Doğrusunu Allah bilir! *(“əl-Bidayə van-Nihayə”, 4/538)*

İmam ən-Nəvəvi deyir: “Alimlər deyirlər ki, bu hədis açıq-aşkar bir hüccətdir ki, Əli - radiyallahu anhu - haqq sahibi idi, doğru idi və ikinci tərəf bağilər idilər, lakin ictihad etmişdilər. Buna görə də daha əvvəl bir neçə yerdə dediyimiz kimi üzərilərində heç bir günah yoxdur...” *(“Şərh Səhih Muslim”, 18/40)*

İbn Həzm əl-Əndəlusi deyir: “Xəta edən müctəhid Allahın razılığını qazanmaq niyyəti ilə haqq olduğunu düşündüyü bir şey üçün vuruşarsa, xətalı olduğunu bilməzsə, əcr qazansa belə yenə də baği sayılır. Əgər döyüşü tərk edərsə üzərinə heç bir hədd düşməz və öldürülənlərə görə qan qisası alınmaz. Lakin əgər xətalı olduğunu bilərək vuruşmağa davam edərsə, belə biri düşməndir, ona müharibə hədləri tətbiq olunmalıdır və tökülən qanlara görə qisas alınmalıdır. Bu, fasiqlik edir, xuruc edir və xətalı müctəhid deyildir. Bunun bəyanı Allahu Təalənin bu sözləridir: ***“Əgər möminlərdən iki tayfa bir-biri ilə savaşarsa, onları barışdırın. Əgər onlardan biri digəri-***

***nə təcavüz edərsə, təcavüz edənlə, o Allahın əmrinə qayıdana kimi savaşın!"*** *(İbn Həzm, "əl-Fəsl fil-Miləl van-Nihəl", 3/77)*

İbn Teymiyyə deyir: "Bəzən bağilik edən təvil edərək, özünün haqq üzərində olduğuna etiqad edərək bunu edir, bəzən də özünün baği olduğunu bilib bunu edir. Bəzən də şübhə və şəhvətlərdən mürəkkəb bir səbəbdən bağilik edə bilər və çox zaman da belə olur. İstənilən halda bunların heç biri Əhl'i-Sünnətin görüşünə münasibətdə heç bir problem yaratmır, çünki Əhl'i-Sünnət nə Muaviyyənin, nə də ondan da əfzəl olan kəslərin günahlardan təmiz olduqlarını demirlər. Əgər günahdan təmiz olduqlarını demirlərsə ictihadda xəta etməkdən uzaq olduqlarını da əlbəttə ki, söyləməzlər. Əksinə deyirlər ki, günahların səbəbləri vardır və tövbə, istiğfar, günahları silən yaxşı əməllər və kəffarə olan müsibətlər və sair səbəblər həmin bu günahların aqibətlərinin qarşısını alır". *("Minhəcus-Sunnətin-Nəbəviyyə", 4/385)*

İmam Əbul-Həsən əl-Əşari - rahiməhullah - deyir: "Eynilə Əli və Muaviyyənin - radiyallahu anhumə - arasında baş verənlər də təvil və ictihad üzərində baş vermişdir. Səhabələrin hamısı etibarlıdır, dində ittiham olunmazlar. Allah onların hamısını tərifləmiş və biz onların hamısına hörmət etməyə, sayğı göstərməyə, təzim etməyə, onları sevməyə, onlardan birinin haqqında hörmətsizlik edən hər bir kəsdən uzaq dur-

mağı etiqad edirik. Allah onların hamısından razı olsun!” *(Əbul-Həsən əl-Əşari, “əl-İbanə”, səh: 190-191; Darul-Bəyan, Dəməşq)*

İmam Nəvəvi yazır:

وَأَمَّا مُعَاوِيَةُ رَضِيَ اللَّهُ عَنْهُ فَهُوَ مِنَ الْعُدُولِ الْفُضَلاءِ وَالصَّحَابَةِ النُّجَبَاءِ رَضِيَ اللَّهُ عَنْهُ وَأَمَّا الْحُرُوبُ الَّتِي جَرَتْ فَكَانَتْ لِكُلِّ طَائِفَةٍ شُبْهَةٌ اعْتَقَدَتْ تَصْوِيبَ أَنْفُسِهَا بِسَبَبِهَا وَكُلُّهُمْ عُدُولٌ رَضِيَ اللَّهُ عَنْهُمْ وَمُتَأَوِّلُونَ فِي حُرُوبِهِمْ وَغَيْرِهَا وَلَمْ يُخْرِجْ شيء مِنْ ذَلِكَ أَحَدًا مِنْهُمْ عَنِ الْعَدَالَةِ لِأَنَّهُمْ مُجْتَهِدُونَ اخْتَلَفُوا فِي مَسَائِلَ مِنْ مَحَلِّ الِاجْتِهَادِ كَمَا يَخْتَلِفُ الْمُجْتَهِدُونَ بَعْدَهُمْ فِي مَسَائِلَ مِنَ الدِّمَاءِ وَغَيْرِهَا وَلَا يَلْزَمُ مِنْ ذَلِكَ نَقْصُ أَحَدٍ مِنْهُمْ وَاعْلَمْ أَنَّ سَبَبَ تِلْكَ الْحُرُوبِ أَنَّ الْقَضَايَا كَانَتْ مُشْتَبِهَةً فَلِشِدَّةِ اشْتِبَاهِهَا اخْتَلَفَ اجتهادهم

“Hz. Muaviyyəyə (r.a) gəlincə; ədalətli, fəzilət sahibi və Səhabə’nin seçginlərindəndir. Hz Əli (r.a) ilə aralarında baş verən savaş, hər iki tərəfin özünə görə doğru yolda olduqlarına inandıqları bəzi səbəblərə müstəniddir. Allah hamısından razı olsun, onların tamamı ədalət sahibidirlər. Aralarında baş verən şeylər, onların heç birin ədalət sifətini düşürməmişdir. Çünki onların hamısı ictihad etmiş/müctəhid kimsələrdir və ictihada məhəl olan nöqtələrdə ixtilaf etmişlərdir. Bəzi müctəhidlərin bir qrup kimsələrin öldürülməsinin caiz olub olmadığı xüsusunda və buna bənzər məsələlərdə etdikləri ictihadlar nəticəsində ixtilaf etmələri kimi ki, ən nəhayətində bu hal onlara bir əksiklik gətirməz. *(Şərh Muslim,15/149)*

Qeyd edim ki, nə Hz.Əli nə də Əmmar ibni Yasir (r.a) Muaviyyənin (r.a) səfində savaşanları kafir gör-

məmişdir.

İbni Əbu Şeybə yazır:

كفر أهل الشام ، : كنت إلى جنب عمار فقال رجل : زياد بن الحارث ، قال لا تقولوا ذلك نبينا و نبيهم واحد و قبلتنا و قبلتهم واحدة، لكنهم : فقال عمار قوم مفترون جاروا عن الحق ، علينا أن نقاتلهم حتى يرجعوا .
#38855- Ziyad ibn Əl Haris dedi: Əmmar ibni Yasirin yanında idim, bir adam dedi: “Şam Əhli küfr etmişdir!” Əmmar ona dedi: “Belə söyləmə! Onların Peyğəmbəri və bizim Peyğəmbərimiz birdir, Bizim qibləmiz və onların qibləsi birdir, lakin onlar asi (Muftərun) qövmdür, Onlar haqqa qarşı gəlmişlərdir və onlarla (onlar haqqa dönənə qədər) savaşacağıq.”
*(Musənnəf ibn Əbi Şeybə #38855)*

İbni Mənzur yazır:

علي فمشى في قتلاه فقال : هؤلاء في الجنة ثم خرج إلى قتلى معاوية فقال : هؤلاء في الجنة ، وليصير الأمر إلي وإلى معاوية
Əli (r.a) öz tərəfindən ölənlərin arasında yeridi və dedi: "Bunlar cənnətdədir". Sonra O, Muaviyyənin (r .a) tərəfindən ölənlərin arasında yeridi və dedi: "Və bunlar da cənnətdədir".
*(Qaynaq :"Müxtəsər-Tarixi Dəməşq"-İbni Mənzur)*

Uca Allah Hucurat surəsində buyurur:
وَإِن طَائِفَتَانِ مِنَ الْمُؤْمِنِينَ اقْتَتَلُوا فَأَصْلِحُوا بَيْنَهُمَا فَإِن بَغَتْ إِحْدَاهُمَا عَلَى الْأُخْرَى فَقَاتِلُوا الَّتِي تَبْغِي حَتَّى تَفِيءَ إِلَى أَمْرِ اللَّهِ فَإِن فَاءتْ فَأَصْلِحُوا بَيْنَهُمَا بِالْعَدْلِ وَأَقْسِطُوا إِنَّ اللَّهَ يُحِبُّ الْمُقْسِطِينَ

***"Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə (itaətinə) qayıdana qədər vuruşun. (Təcavüzkarlıq edən Allahın əmrinə) qayıtsa, hər iki dəstənin arasını düzəldin və insafla hərəkət edin. Şübhəsiz ki, Allah insaflıları sevər! (Hucurat-9)***

Uca Allah bir-biriylə savaşdığı halda iki topluluğuda müsəlman gördüyü halda digər bir tərəfi kafir görənlərin onları kafir görməsinin nə önəmi var? Lakin deyə bilərik ki, digər tərəf ictihadında xəta etmişdir.

İmam Buxari *"Əs Səhih"*ində yazır:

حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ مُحَمَّدٍ، حَدَّثَنَا سُفْيَانُ، عَنْ أَبِي مُوسَى، قَالَ سَمِعْتُ الْحَسَنَ، يَقُولُ اسْتَقْبَلَ وَاللَّهِ الْحَسَنُ بْنُ عَلِيٍّ مُعَاوِيَةَ بِكَتَائِبَ أَمْثَالِ الْجِبَالِ فَقَالَ عَمْرُو بْنُ الْعَاصِ إِنِّي لأَرَى كَتَائِبَ لاَ تُوَلِّي حَتَّى تَقْتُلَ أَقْرَانَهَا. فَقَالَ لَهُ مُعَاوِيَةُ ـ وَكَانَ وَاللَّهِ خَيْرَ الرَّجُلَيْنِ ـ أَىْ عَمْرُو إِنْ قَتَلَ هَؤُلاَءِ هَؤُلاَءِ وَهَؤُلاَءِ هَؤُلاَءِ مَنْ لِي بِأُمُورِ النَّاسِ مَنْ لِي بِنِسَائِهِمْ، مَنْ لِي بِضَيْعَتِهِمْ فَبَعَثَ إِلَيْهِ رَجُلَيْنِ مِنْ قُرَيْشٍ مِنْ بَنِي عَبْدِ شَمْسٍ عَبْدَ الرَّحْمَنِ بْنَ سَمُرَةَ وَعَبْدَ اللَّهِ بْنَ عَامِرِ بْنِ كُرَيْزٍ، فَقَالَ اذْهَبَا إِلَى هَذَا الرَّجُلِ فَاعْرِضَا عَلَيْهِ، وَقُولاَ لَهُ، وَاطْلُبَا إِلَيْهِ. فَأَتَيَاهُ، فَدَخَلاَ عَلَيْهِ فَتَكَلَّمَا، وَقَالاَ لَهُ، فَطَلَبَا إِلَيْهِ، فَقَالَ لَهُمَا الْحَسَنُ بْنُ عَلِيٍّ إِنَّا بَنُو عَبْدِ الْمُطَّلِبِ، قَدْ أَصَبْنَا مِنْ هَذَا الْمَالِ، وَإِنَّ هَذِهِ الأُمَّةَ قَدْ عَاثَتْ فِي دِمَائِهَا. قَالاَ فَإِنَّهُ يَعْرِضُ عَلَيْكَ كَذَا وَكَذَا وَيَطْلُبُ إِلَيْكَ وَيَسْأَلُكَ. قَالَ فَمَنْ لِي بِهَذَا قَالاَ نَحْنُ لَكَ بِهِ. فَمَا سَأَلَهُمَا شَيْئًا إِلاَّ قَالاَ نَحْنُ لَكَ بِهِ. فَصَالَحَهُ، فَقَالَ الْحَسَنُ وَلَقَدْ سَمِعْتُ أَبَا بَكْرَةَ يَقُولُ رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ عَلَى الْمِنْبَرِ وَالْحَسَنُ بْنُ عَلِيٍّ إِلَى جَنْبِهِ، وَهْوَ يُقْبِلُ عَلَى النَّاسِ مَرَّةً وَعَلَيْهِ أُخْرَى وَيَقُولُ " إِنَّ ابْنِي هَذَا سَيِّدٌ، وَلَعَلَّ اللَّهَ أَنْ يُصْلِحَ بِهِ بَيْنَ فِئَتَيْنِ عَظِيمَتَيْنِ مِنَ الْمُسْلِمِينَ ". قَالَ لِي عَلِيُّ بْنُ عَبْدِ اللَّهِ إِنَّمَا ثَبَتَ لَنَا سَمَاعُ الْحَسَنِ مِنْ أَبِي بَكْرَةَ بِهَذَا الْحَدِيثِ

Həsənül Bəsri nəql edir: ″Həsən ibni Əli (r.a) Vallahi, Hz.Muaviyyəni (r.a) dağlar kimi böyük bir orduyla qarşıladı. Bunun üzərinə Amr ibnul As Hz.Muaviyyəyə: ″Mən, Vallahi elə əsgəri birliklər görürəm ki, bunlar özləri kimi (sayca və keyfiyyətcə) eyni olan birlikləri öldürmədikcə geri dönməzlər". Hz.Muaviyyədə (r.a) Amra (r.a)-ki, Muaviyyə bu iki adamın xeyirlisidir-bu cavabı verdi: ″Ey Amr, de görək, bunlar (bizimkilər) onları, onlarda bunları öldürsələr, müsəlmanların işlərini kim mənim adıma aparacaq, kim qadınlarının və yetimlərinin baxımlarını öz üzərinə alacaq?″

Hz.Muaviyyə sülh etmək üçün, Qureyşin Bəni Əbduşşəms boyundan iki nəfəri, yəni Abdurrahmən ibni Səmurə və Abdullah ibni Amrı, Hz.Həsənə (r.a) göndərdi. Bunlara: "O zata (Hz.Həsənə) gedin və ona (sülh bağlamaq) istədiyimizi söyləyin.
(Xilafət arzusundan) əl çəkməsini söyləyin, (buna müqabil nə istərlərsə) verin. ″Bunlar Hz.Həsənin (r.a ) yanına gedib hüzuruna çıxdılar (Hz.Muaviyyənin sözlərinə uyğun şəkildə danışdılar), (xilafəti Hz.Muaviyyəyə buraxması halında nə istərsə verəcəyini) söylədilər. Hz.Həsən (r.a) onlara: ″Bizlər Əbdulmuttəlibin oğullarıyıq. Beytul maldan bir hissəmiz var. Bu ümmət (ehtiyac qarşısında) mal üçün qanını sərf etməyə başladı. (Beytul maldan bizə ayrılacaq hissə nədir?) dedi. Onlar: ″Hz.Muaviyyə sizdən bunları tələb edir, xilafətdən əl çəkmənizi istəyir, müqabilində

nə istədiyinizi soruşur" dedilər. Hz.Həsən(r.a): "Sizin bu vədlərinizi bizə kim təkəlluf edəcək?" dedi. Elçilər: "Biz təkəlluf edirik, sizə bu təminat veririk" dedilər. Hz.Həsən (r.a) hər nə tələb etdiysə hamısına: " təkəlluf edirik" deyərək təminat verdilər.
Beləcə, Hz.Həsən Hz.Muaviyyə ilə sülh etdi. Həsən əl Bəsri demişdir ki: "Mən Əbu Bəkrdən (r.a) eşitdim belə dedi: "Rasulullahı (s.a.s) minbərdə gördüm, yanında Həsən ibni Əli vardı, bəzən xalqa yönəlir, bəzəndə Həsənə yönəlir və : ***"Bu oğlum seyyiddir, umulur ki, Allah onunla iki müəzzəm müsəlman ordunu sülhə qovuşduracaq "*** deyirdi. *(Buxari kitab #49, Hədis #867)*

İmam Beyhəqi bu hədisi şərh edərkən deyir:

قَالَ سُفْيَانُ: قَوْلُهُ «فِئَتَيْنِ مِنَ الْمُسْلِمِينَ» يُعْجِبُنَا جِدًّا، قَالَ الشَّيْخُ: وَإِنَّمَا أَعْجَبَهُمْ لِأَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَمَّاهُمَا جَمِيعًا مُسْلِمِينَ، وَهَذَا خَبَرٌ مِنْ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمَا كَانَ مِنَ الْحَسَنِ بْنِ عَلِيٍّ بَعْدَ وَفَاةِ عَلِيٍّ فِي تَسْلِيمِهِ الْأَمْرَ إِلَى مُعَاوِيَةَ بْنِ أَبِي سُفْيَانَ،

Sufyan "müsəlmanlardan iki qrup (un barışması)" ifadəsi haqqında dedi. Bunu çox sevirəm. (Əl Beyhəqi) dedi: "Onun bunu sevməsinin səbəbi Rasulullahın (s.a.s) onların hamısına "Müsəlman" deməsidir.
Bu xəbər, Əlinin (r.a) vəfatından sonra Həsən ibni Əlinin (r.a) Muaviyyə ibni Əbu Sufyanın (r.a) xəlifəliyini qəbul edincə gerçəkləşdi". *(Əl Etiqad əl Beyhəqi 1/376)*

İmam İbni Həcər isə bu hədisin şərhində deyir:

قال ابن بطال : هذا يدل على أن معاوية كان هو الراغب في الصلح وأنه عرض على الحسن المال ورغبه فيه وحثه على رفع السيف وذكره ما وعده به جده ﷺ من سيادته في الإصلاح به

"İbn Battal dedi: "Bu dəlildir ki, Muaviyyə sülh istəmiş və bunu Həsənə (r.a) təklif etmiş, buna niyyət etmiş və qılınc çəkməmiş kimsəydi. Və ona (Həsənə) ( xatırlatmışdı) ki, babası Peyğəmbərin (s.a.s) sənin ( Həsənin) haqqında ***"Bu oğlum seyyiddir, Allah onun vasitəsiylə (iki böyük müsəlman topluluğu) barışdıracaq"*** sözü var. *(Fəthul Bari ,Kitab əl Fitən)*

## 2. İshaq ibn Rəhaveyh dedi: Rasulullahdan (s.a.s) Muaviyyənin (r.a) fəzilətinə dair heç bir səhih hədis yoxdur" iddiasina cavab

Hz.Muaviyyə düşmənlərinin gətirdiyi şübhələrdən biri də budur ki,

İmam Zəhəbi *"Siyər aləm ən Nübəla cild 3 səh 132"* yazır:

**الأصم حدثنا أبي سمعت ابن راهويه يقول لا يصح عن النبي ﷺ في فضل معاوية شيء**

İshaq ibni Rəhaveyh dedi: "Rasulullahdan (s.a.s) Muaviyyənin fəzilətinə dair heç bir səhih hədis yoxdur".

**Cavab:**

**a)** Bu isbat olunmamışdır
Şeyx Muhəmməd əl Şənqiti deyir: "Bu ifadə batildir

və İshaq ibni Rəhaveyhdən (gəldiyi) isbat olunmamışdır.
Zəhəbinin *"Siyər"*ində 3/312-də, Şövqaninin *"Əl Fəvaid əl Məcmua"*sında səh 408-söyləndiyi kimi, Əl Hakim tərəfindən Əbu Muhəmməd ibn Yaqub Əl Asm o da atasından o da İshaq ibn Rəhaveyhdən eşitdiyini nəql etmişdir.. Fəvaiddə "Həddəsənə Əbi" ifadəsi zikr edilməmişdir (Fəvaiddə Əl Asm İshaq ibn Rəhaveyhdən birbaşa nəql etmişdir).

**1.** Əl Asm-O, 247 h-ci ildə doğulmuş və 237 h-də vəfat edən İshaq ibni Rəhaveyhdən eşitməmişdir.
**2.** Yaqub ibni Yusəf ibni Muaqəl Əbul Fədl ən Neysəburi-O, Əl Asmın atasıdır. Heç kim tərəfindən siqə sayılmamışdır. Xatib Bağdadi *"Tarixi Bağdadda 14/286 no. 7582"*- onun biografiyasında deyir:" Yaqub ibni Yusəf ibni Muaqəl Əbul Fədl ən Neysəburi, Bağdada gəldi və İshaq ibni Rəhaveyhdən nəql etdi. Muhəmməd İbni Məxləddə ondan nəql etmişdir". Sonra Xatib onun haqqında heç bir cərh və tədilə yer verməmişdir.

O, *"Siyər Aləm ən Nubəla"*-da 15/453 oğlunun biografiyasında zikr edilmişdir və imam Zəhəbi də onun haqqında heç bir cərh və tədilə yer verməmişdir.

Yəni, bu ifadə isbat edilməmişdir və İshaq ibni Rəhaveyhdən (gələn bu nəql) zəifdir. İmam İshaq bunu necə deyəbilər ki? *(Əl Hədis ən Nəbəviyyə fi fədail Muaviyyə ibni Əbu Sufyan səh 45-46)*

**Hz.Muaviyyənin (r.a) fəzilətinə dair bir çox səhih hədis gəlmişdir ki, alimlər də öz kitablarında bunları iqrar etməkdədir**

**b)** İmam İbni Əsakir (r.a) yazır:

وأصح ما رُوي في فضل معاوية حديث أبي حمزة عن ابن عباس أنه كاتِبُ النبيِّ منذ أسلم، أخرجه مسلم في صحيحه. وبعده حديث العرباض: اللهم علمه الكتاب. وبعد حديث ابن أبي عَميرة: اللهم اجعله هاديا مهديا"

"Muaviyyənin fəzilətləri barəsində nəql edilənlərin ən səhihi Əbu Həmzənin İbni Abbasdan Onun İslamı qəbul etdikdən sonra vəhy katibi olmasıdır ki, Muslim tərəfindən *"Səhih"*ində nəql edilmişdir". Bundan sonra *"Əl İrbad"*dakı ***"Allahım ona kitabı öyrət"*** rəvayəti və daha sonrada İbni Əbu Umeyrənin: ***"Allahım onu hidayət et və hidayət edici qıl"*** hədisidir". *(Tarixi Mədinətul Diməşq (59/106), Əlbani bunu Əs-Səhihəsində cild 7, səh 694, Hədis no:3227-də sitat gətirmişdir)*

**c)** İbni Kəsir: ***"Allahım, Muaviyyəyə hesabı və kitabı öyrət və onu əzabdan qoru"*** hədisini zikr etdikdən sonra yazır:

وقد اعتنى ابن عساكر بهذا الحديث وأطنب فيه، وأطيب وأطرب، وأفاد وأجاد، وأحسن الانتقاد، فرحمه الله، كم له من موطن قد تبرز فيه على غيره من الحفاظ والنقاد.

"İbni Əsakir bu hədisi mütəşəkkil və ətraflı halda ən

gözəl və yaxşı şəkildə zikr etmişdir. Allah ona rəhmət etsin. O bir çox sahədə (digər) Huffaz və tənqidçilərdən öndə idi". *(Əl Bidayə vən Nihayə 8/160)*

Sonra İbni Kəsir digər bir hədisi sitat gətirərək deyir:

**ثم ساق ابن عساكر أحاديث كثيرة موضوعة بلا شك في فضل معاوية، أضربنا عنها صفحا، واكتفينا بما أوردناه من الأحاديث الصحاح والحسان والمستجادات عما سواها من الموضعات والمنكرات.**

**ثم قال ابن عساكر: وأصح ما روي في فضل معاوية حديث أبي جمرة، عن ابن عباس: أنه كان كاتب النبي ﷺ منذ أسلم.**

**أخرجه مسلم في صحيحه.**

**وبعده حديث العرباض: «اللهم علم معاوية الكتاب».**

**وبعده حديث ابن أبي عمير: «اللهم اجعله هاديا مهديا».**

"Sonra İbni Əsakir Muaviyyənin fəzilətlərinə dair şübhəsiz bir çox uydurma (hədislər) zikr etmişdir ki, mən onları zikr etmədim. Bu uydurmalara qarşı səhih, həsən və güclü hədisləri zikr etdim.
İbni Əsakir dedi: "Muaviyyənin fəzilətləri barəsində nəql edilənlərin ən səhihi Əbu Həmzənin İbni Abbasdan Onun İslamı qəbul etdikdən sonra vəhy katibi olmasıdır ki, Muslim tərəfindən *"Səhih"*ində nəql edilmişdir". Bundan sonra *"Əl İrbad"*dakı ***"Allahım ona kitabı öyrət"*** rəvayəti və daha sonrada İbni Əbu Umeyrənin: ***"Allahım onu hidayət et və hidayət edici qıl"*** hədisidir". *(Əl Bidayə vən Nihayə 8/161)*

**d)** İmam Zəhəbi yazır:

**وذكر المفضل الغلابي: أن زيد بن ثابت كان كاتب وحي رسول الله ﷺ، وكان معاوية كاتبه فيما بينه وبين العرب. كذا قال. وقد صح عن ابن عباس قال: كنت ألعب، فدعاني رسول الله ﷺ وقال: ادع لي معاوية وكان يكتب الوحي. وقال معاوية بن صالح، عن يونس بن سيف، عن الحارث بن زياد، عن أبي رهم السماعي، عن العرباض بن سارية: سمعت رسول الله ﷺ وهو يدعونا إلى السحور: هلم إلى الغداء المبارك. ثم سمعته يقول: اللهم علم معاوية الكتاب والحساب، وقه العذاب. رواه أحمد في مسنده، وقد وهم فيه قتيبة، وأسقط منه أبا رهم والعرباض. وقيل أبو مسهر: ثنا سعيد بن عبد العزيز، عن ربيعة بن يزيد، عن عبد الرحمن بن أبي عميرة المزني وكان من أصحاب النبي ﷺ، أن النبي ﷺ قال لمعاوية: اللهم علمه الكتاب والحساب، وقه العذاب. هذا الحديث رواته ثقات، لكن اختلفوا في صحبة عبد الرحمن، والأظهر أنه صحابي،**

**روي نحوه من وجوه أخر. وقال مروان الطاطري: ثنا سعيد بن عبد العزيز، حدثني ربيعة بن يزيد، سمعت عبد الرحمن بن أبي عميرة يقول: سمعت رسول الله صلى الله عليه وسلم يقول**

**لمعاوية: اللهم اجعله هادياً مهدياً، واهده واهد به. رواه الوليد بن مسلم، وأبو مسهر، عن سعيد، نحوه، رواه الترمذي، عن الذهلي، عن أبي مسهر، وقال: حسن غريب.**

“Əl Mufdəl əl Ğlabi nəql etdi: ”Zeyd ibni Sabit Rasulullahın (s.a.s) vəhy katibi idi və Muaviyyə də məktubları yazardı. Lakin səhih bir şəkildə ibni Abbasdan isbat olunmuşdur ki, o dedi: ”Mən (uşaqlarla ) oynayarkən Rasulullah (s.a.s) məni çağırdı və dedi: ***”Get və Muaviyyəni çağır”*** və o (gələn) vəhyləri yazardı… Əl Ərbad ibni Səriyyə əs Suleymi nəql etdi ki, Rasulullahı (s.a.s) belə deyərkən eşitdim: ***”Ey Allahım, Muaviyyəyə hesabı və kitabı öyrət və onu əzab-***

***dan qoru"*** *(Əz-zəhəbi "Siyər Aləm Ən Nübəla 3/124 "-da bu hədisin güclü şahid olduğunu söyləmişdir)*...

Əbdurrahmən ibni Əbu Umeyrə dedi ki, Rasulullah (s.a.s) dedi: ***"Allahım ona hesabı və kitabı öyrət  və onu əzabdan qoru".*** (İbni Əbu Umeyrənin) bu hədisinin raviləri siqədir, lakin Əbdurrahmənin səhabə olmasında ixtilaf vardır. Lakin daha doğru olan onun səhabə olduğudur. Əbdurrahmən ibni Əbu Umeyrə dedi. (Rasulullah (s.a.s) dedi): ***"Allahım Muaviyyəyə hidayət et, onu hidayət edici qıl və insanları onunla hidayətə çatdır".*** Tirmizi dedi ki, bu hədis "Həsən Qərib"dir. *(Tarix ul İslam 4/309-310)*

## 3. Rasulullah (s.a.s) dedi: "Allah onun (Muaviyyənin) qarnını doyurmasın" hədisinin izahı

*"Səhih Muslim"*də bu hədisə rast gəlirik:

عن ابن عباس ، قال : كنت ألعَب مع الصبيان ، فجاءَ رسولَ الله صلى الله عليهوسلم فتواريتُ خلفَ بابٍ ، قال فجاءَ فحطَأَني حَطْأَةً ، وقال : «اذهَبْ وادعُ لي معاويةَ» قال : فجئتُ فقلت : هو يأكل ، قال : ثم قال لي : «اذهَبْ فادعُ لي معاوية» قال : فجئتُ فقلْت : هو يأكل ، فقال : لا أشبَعَ اللهُ بطْنَه

"İbn Abbasdan: Uşaqlarla oynayırdım. Rasulullah gəldi və mən bir qapının arxasında gizləndim. Gəlib boynumun arxasına yüngül toxundu və dedi: ***"Get Muaviyəni çağır! Gedib gəldim və yemək yediyini dedim. Eyni şey bir daha təkrarlandı və Rasulullah***

***buyurdu: Allah onun qarnını doyurmasın!"***
*(Muslim, kitab #032, Hədis #6298)*

**Cavab:**

İbn Həcər əl-Məkki bu hədisi şərh edərək deyir: "Bu hədisdə Muaviyyə əleyhində bir nöqsan yoxdur. **Birincisi:** hədisdə qeyd olunmur ki, İbn Abbas gəlib Muaviyyəyə "Allahın Elçisi - sallallahu aleyhi va səlləm - səni çağırır" və o, qəsdən vaxtı uzatdı. Burada sadəcə olaraq bir ehtimal var ki, İbn Abbas onu yemək yeyərkən görmüş, həya etmiş, sonra peyğəmbərin - sallallahu aleyhi va səlləm - yanına gələrək onun yemək yediyini xəbər vermişdir. Eyni şey ikinci dəfə də təkrarlanmışdır.
**İkinci:** İbn Abbasın Muaviyyəyə peyğəmbərin - sallallahu aleyhi va səlləm - tələbini xəbər verdiyini fərz etsək belə burada daha bir ehtimal vardır ki, Muaviyyə bu işdə bir sərbəstlik olduğunu və dərhal cavab verməyin tələb olunmadığını zənn etmişdir.
**Üçüncü:** Bu duanın peyğəmbərin - sallallahu aleyhi va səlləm - dilindən qəsd olmadan çıxması da mümkündür, necəki əshabından bəzilərinə ***"sağ əlin torpağa bulaşsın!"*** və möminlərin analarından bəzilərinə isə ***"Allah səni kəssin də ağrısını boğazında hiss edəsən!"*** deməsi və buna bənzər sözlər mənalarını qəsd etmədən bir adət olaraq dillərində işlətdikləri sözlərdəndir." *(Muxtəsar Tathir əl-Cənan val-Lisan, səh : 90-91)*

İmam ən-Nəvəvi bu hədisdən sonra deyir:

**وأما دعاؤه على معاوية أن لا يشبع حين تأخر ؛ ففيه الجوابان السابقان : أحدهما أنه جرى على اللسان بلا قصد . والثاني : أنه عقوبة له لتأخره ، وقد فهم مسلم رحمه الله من هذا الحديث أن معاوية لم يكن مستحقا للدعاء عليه ، فلهذا أدخله في هذا الباب ، وجعله غيره من مناقب معاوية لأنه في الحقيقة يصير دعاء له "**

"Gec gəldiyi üçün qarnının doymaması ilə Muaviyyəyə qarşı dua etməsinə gəldikdə isə, bunda iki cavab vardır: **Birinci:** Bu, qəsd edilmədən dildə işlədilən bir sözdür. **İkinci:** Bu, gec gəldiyi üçün aqibətidir. Muslim - rahiməhullah - bu hədisdən anlamışdır ki, Muaviyyə bu bəd-duaya layiq olmamışdır, ona görə hədisi bu baba daxil etmişdir. Başqa alimlər isə bunu Muaviyyə üçün bir fəzilət hesab ediblər, çünki həqiqətdə bu dua onun leyhinə olur". *("Şərh Səhih Muslim", 16/156; eləcədə bax: "əl-Minhəc Şərh Səhih Muslim bin əl-Həccac", 16/156)*

Əl-Hafiz əl-İraqi - rahiməhullah - deyir: "O, söyərkən, bəd-dua edərkən və bunun kimi ondan hasil olmuş şeyləri edərkən bunları qəsd edərək etməmişdir, əksinə bu ərəblərin adətində olan sözü niyyət etmədən söyləmək növündəndir. Onun ***"sağ əlin torpağa bulaşsın!", "Allah səni kəssin də ağrısını boğazında hiss edəsən!"*** və Ənəs'in hədisində Ummu Suleym'in yetim qızına söylədiyi ***"Allah sənin kimilərin sayını artırmasın!"*** və Muaviyyə'nin hədisində ***"Allah onun qarnını doyurmasın!"*** və bunun bənzər sözləri buna misaldır. Bunların heç biri ilə hə-

qiqi duanı qəsd etmirlər. Allahın Elçisi bu dualarından hər hansı birinin müstəcəb olmasından qorxduğu üçün Rəbbindən - Subhənəhu - dilək dilədi və ondan bunu rəhmət, kəffarə, qürbət, təmizləyici səbəb və əcr etməsini istədi. Belə hallar çox nadir zamanlarda baş verirdi...” *(əl-İraqi, "Tarhut-Təsrib fi Şərhit-Təqrib", 8/13)*

Hafiz əz-Zəhəbi *“əs-Siyər”*də deyir:

**قلت: لعل هذه منقبة معاوية لقول النبي ﷺ: اللهم من لعنته أو شتمته فاجعل ذلك له زكاة ورحمة.**

“Bunun Muaviyyə’nin bir fəziləti də olduğu söylənə bilər, çünki peyğəmbər - sallallahu aleyhi va sələm - demişdir: ***“Allahım! Kimə lənət etmişəmsə, kimi söymüşəmsə bunu onun üçün bir təmizləmə və bir rəhmət et!”*** *("Siyər aləm ən-Nubələ", 14/130; Bunun eynisini " Təzkiratul-Huffaz" kitabında da (2/699) demişdir)*

İmam Muslim *“əs-Səhih”*də Muaviyyə haqqında gəlmiş bu hədislə bərabər mövzunu bizə daha da gözəl izah edəcək digər hədisləri də qeyd etmişdir.

Anamız Aişə - radiyallahu anhə - rəvayət edir: ***“Peyğəmbərin - salləllahu aleyhi va səlləm - yanına iki kişi daxil oldu, onunla nəsə danışdılar və nə danışdıqlarını bilmədim. Onu qəzəbləndirdilər. Onların ikisinə də lənət etdi və onları söydü! Onlar yanından çıxdıqda dedim: “Ey Allahın Elçisi! Bu iki nəfərin qazandıqları xeyrdən kim bir şey qazana bilər?”***

***Soruşdu: "O, nədir ki?" Dedim: "Sən onlara lənət etdin, onları söydün!" Dedi: "Məgər Rəbbimlə kəsdiyim şərti bilmirsənmi? Dedim: "Ey Allahım! Mən bir bəşərəm, müsəlmanlardan kiməsə lənət etsəm, onu söysəm bunu onun üçün bir təmizlənmə və bir əcr et"*** *("Səhih Muslim", 2600)*

Əbu Hureyrə - radiyallahu anhu - rəvayət edir ki, peyğəmbər - sallallahu aleyhi va səlləm - dedi: ***"Allahım! Mən Səndən əhdi-peyman alıram və sən bunda mənə xələf çıxmazsan! Mən sadəcə bir bəşərəm, hansı möminə əziyyət etsəm, onu söysəm, ona lənət etsəm, onu döyərsəm bunu onun üçün xeyir-dua, bir təmizlənmə və onunla Sənə Qiyamət günü yaxınlaşacağı bir qürbət et!".*** *("Səhih Muslim", 2601)*

İbni Kəsir yazır:
فركب مسلم من الحديث الأول وهذا الحديث فضيلة لمعاوية
"Muslim ***(Allah onun qarnını doyurmasın)*** hədisini öncəki hədisdən ***(Allahım! Kimə lənət etmişəmsə, kimi söymüşəmsə bunu onun üçün bir təmizləmə və bir rəhmət et)*** sonra gətirmişdir və bu hədisdə Muaviyyə üçün fəzilət vardır". *(Əl Bidayə vən Nihayə 8/120)*

## 4. İmam Nəsainin Muaviyyə əleyhdarlığı səbəbindən qətlə yetirildiyi şübhəsi :

İbni Kəsir yazır:
وقال الدارَقطْني : كان أفْقهَ مشايخِ مصرَ في عصرِه ، وأعْرفَهم بالصحيحِ والسَّقِيمِ مِن الآثارِ ، وأعرفَهم بالرِّجال ، فلما بلَغ هذا المبلَغَ حسَدُوه , فخرَج إلى الرَّمْلةِ ، فسُئل عن فضائلِ مُعاويةَ

فأمسكَ عنه , فضرَبوه في الجامعِ ، فقال : أخْرِجوني إلى مكةَ ، فأخرَجوه وهو عليلٌ ، فتُوفِّي بمكة مقتولاً شهيدًا

قال الحاكمُ : مع ما رُزق النسائيُّ مِن الفضائلِ رُزق الشهادةَ في آخِرِ عُمُره ، ومات بمكةَ سنةَ ثلاثٍ وثلاثمائة ...

"Dəraqutni dedi: (İmam Nəsai) Misir şeyxlərinin ən fəqihi, hədislərin səhihini və zəifini ən yaxşı tanıyanı , "rical"ı ən yaxşı biləni idi.
Bu mərtəbəyə çatdıqda insanlar ona həsəd elədilər o da (Fələstinin) Rəmlə şəhərinə getdi. Orada ondan Muaviyyənin fəziləti haqqında soruşsalar da susub cavab vermədi. Məscidin içində onu döydülər.
Məkkəyə götürülməsini istədi və xəstə olduğu halda onu Məkkəyə götürdülər. Məkkədə məqtul, şəhid olaraq öldü.
Hakim dedi: Nəsaiyə bu qədər fəzilətlə yanaşı ömrünün sonunda şəhid olmaq da nəsib oldu. Məkkədə hicri 303-cü ildə vəfat etdi..." *(İbn Kəsir: Əl Bidayə vən Nihayə: 14/794-795)*

**Cavab:**

**a)** Şeyx Zubeyr Əli deyir: "Dəraqutni H. 305-306-cı illərdə dünyaya gəlmiş və Nəsaidə 303 H-də vəfat etmişdir. Bu rəvayətin isnadı qopuq və Mərduddur". *(Təhqiqi İslahi İlmi Məqalət səh 273)*

**b)** Bu rəvayət həmçinin Hakim tərəfindən *"Mərifət ulum əl hədis səh 182"*-də, Muhəmməd ibni İshaq (ibni

Muhəmməd ibni Yəhya ibni Məndəh) Əsbəhani tərəfindən nəql edimişdir ki, şeyxləri bu rəvayəti söyləyib”.

Şeyx Zubeyr Əli, buna belə cavab verir: ”Bu şeyxlərin hamısı məchuldur və bu səbəbdən rəvayət zəifdir ”. *(Təhqiqi İslahi İlmi Məqalət səh 273)*

Zəhəbi, bu rəvayəti İbn Məndədən o da Həmzə Əl Əqbi Əl Misridən nəql edir. *(Siyər 14/132)*

Şeyx Zubeyr Əli dedi: ”İsnadı yoxdur”. *(Təhqiqi İslahi İlmi Məqalət səh 273)*

**b)** Kəməluddin ibnul Adim (588-660 h/1192-1262 m) *“Buğyətut Taləb”* əsərində Nəsainin tərcümeyi halından bəhs edərkən deyir:

قرأ عليَّ أبو عبدِ الرحمن النسائي كتابَ الخصائص فقلتُ له : حدّثني بفضائلِ معاوية ، فجاءني

: بعدَ جمعة بوَرَقةٍ فيها حديثانِ ، فقلتُ

أهذه بَس ؟ فقال : وليستْ بصِحاحٍ ، هذه غرِم معاويةُ عليها الدراهمَ ، فقلت له : أنتَ شيخُ

سوءٍ ، لا تُجاوِرْني ، فقال : ولا لي في جوارِك حظٌّ ، وخرَج

قال علي بن مُحَّد المادرائي : وحدَّثني أهل بيتِ المقدِس قالوا : قرَأ عليْنا أبو عبد الرحمن النسائي

كتابَ الخصائص ، فقلتُ له : أينَ فضائلُ معاوية ؟ فقال : وما يرضَى معاوية أن يُسكَت عنه

، قال : فرَجمناه وضغَطناه ، وجعْلنا نضرِب جنْبه ، فمات بعد ثلاثٍ

“Hafiz Əbu Tahir Əhməd bin Muhəmməd Əs Siləfinin xəttindən oxudum (sənədi zikr edir): Əbu Abdir Rahmən Ən Nəsai *“Əl Xasais”* kitabını mənə oxudu. Mən ona belə dedim: Mənə Muaviyyənin fəzilətindən bəhs et. O da Cümədən sonra mənə üzərində iki

hədis yazılı bir vərəq gətirdi. Mən soruşdum: Elə bu-mu? Nəsai dedi: Bunlar da səhih deyil. Muaviyyə bunlar üçün pul ödəyib (yazdırmışdır).
Mən ona dedim: Sən pis adamsan. Mənimlə oturub durma! Nəsai dedi: Səninlə oturmaq mənim üçün xoşbəxtlik deyil. Sonra çıxıb getdi.
Əli bin Muhəmməd Əl Mədərai dedi: Beytul Maqdis əhli mənə belə dedilər: Əbu Abdir Rahmən Ən Nəsai *"Əl Xasais"* kitabını bizə oxudu. Mən ondan soruşdum: Bəs Muaviyyənin fəzilətləri hanı? Nəsai dedi: Muaviyyə onun haqqında susulmasına razı olmazmı? (bir də onun fəzilətinimi rəvayət edək?)
Biz də onu daşa basıb, əzdik. Böyürlərinə vurduq. Üç gün sonra öldü..." *(Kəmaluddin İbnul Adim: Buğyətut Taləb: 2/785)*

**Cavab:**

Hafiz əs Səxavi dedi:

لا يصح –"Səhih deyildir"[ ( بغية الراغب المتمني في ختم النسائي رواية ابن السني ص-130)

Eyni zamanda bu hədisin isnadı belədir ki **أخبرنا أبو عبد الله محمد بن الحسن بن عمر الصيرفي قال: حدثنا أبو اسحق ابراهيم ين نصر البزاز، وكتبه لي بخطه، قال: حدثنا علي بن محمد الكاتب المادرائي قال: حدثني أبو منصور تكين الأمير قال**

Ravilərdən-أبو عبد الله محمد بن الحسن بن عمر الصيرفي və أبو اسحاق ابراهيم بن نصر البزاز- siqə deyillərdir

**c)** Bütün söylənənlərə qarşı İmam Nəsainin öz tələbəsi  İbni Yunus əl Misri  (Nəsainin vəfatı haqqında) deyir:

وكان خروجه من مصر فى ذى القعدة سنة اثنتين وثلاثمائة، وتوفى بفلسطين يوم الاثنين لثلاث عشرة خلت من صفر سنة ثلاث وثلاثمائة

"O, Misirdən 302 H Zilqədə ayında getdi və fələsində Səfər ayının 13-ü Bazar ertəsi günü vəfat etdi". *(Tarix İbn Yunus 2/24 no. 55)*

Hafiz əz Zəhəbi ibni Yunusun sözlərini sitat gətirərək deyir:

قُلْتُ: هَذَا أَصحُّ، فَإِنَّ ابْنَ يُوْنُسَ حَافِظٌ يَقِظٌ وَقَدْ أَخَذَ عَنِ النَّسَائِيِّ، وَهُوَ بِهِ عَارِفٌ

"Deyirəm ki, bu (daha) səhihdir. İbni Yunus hafiz, Nəsainin tələbəsi və Arifdir". *(Siyər 14/133)*

Şeyx Zubeyr Əli deyir: "Əgər bu hadisə (Nəsainin döyülərək öldürülməsi) baş vermişsə nə üçün Nəsainin öz tələbəsi onun ölümü haqqında belə vacib məsələni zikr etməmişdir? *(Təhqiqi İslah İlmi Məqalət" cild 6 səh 275)*

Dr.Bəşər Əl Əvvəd yazır:

ورجع الذهبي قول الطحاوي وابن يونس وصححه كما في تاريخ الاسلام (الورقة: 13 أحمد الثالث 2917 / 9) وتابعه في ذلك تلميذه الصلاح الصفدي (في الوافي 6 / 417) .

"Zəhəbi, İmam Təhavi və İbni Yunusun (Nəsainin

ölümü ilə əlaqədar) ifadlərini, *"Tarix əl İslam, 9/2917 "*-da bildirildiyi kimi doğrulamış, tələbəsi Salah əs Səfidə *"Əl Vafidə, 6/417"* onu (n yolunu) izləmişdir". *(Təhqiq Təhzib əl Kamal 1328)*

## İmam Nəsainin özü kitablarında Muaviyyədən gələn hədisləri zikr etmişdir

Şeyx Təha Kəran deyir: "Muaviyyədən səhih sittədə gələn 50 hədis vardır ki, bunun 29-nu İmam Nəsai öz kitablarına daxil etmiş, 13-nü isə sadəcə özü zikr etmişdir". *(əl-Mizzi: Tuhfət əl-Əşrəf, cild. 8 səh 434 -455)*

İmam Nəsai *"Sünən ən Nəsai"*də (No:5095, 683, 2558 və s) hədislərini Muaviyyə isnadıyla zikr etmişdir.

Əl Mizzi dedi:
قال الْحَافِظ أبو القاسم : وهذه الحكاية لاتدل على سوء اعتقاد أَبِي عَبْد الرَّحْمَنِ فِي معاوية بْن أبي سفيان، وإنما تدل على الكف فِي ذكره بكل حال.

ثم روى بإسناده عَن أَبِي الْحَسَن علي بْن مُحَمَّد القابسي، قال: سمعت أَبَا علي الْحَسَن بْن أَبِي هلال يَقُول: سئل أَبُو عَبْد الرَّحْمَنِ النَّسَائي عَنْ معاوية بْن أَبِي سفيان صاحب رَسُول اللَّهِ ﷺ، فَقَالَ: إنما الإسلام كدار لها باب، فباب الإسلام الصحابة، فمن آذى الصحابة إنما أراد الإسلام، كمن نقر الباب إنما يريد دخول الدار، قال: فمن أراد معاوية فإنما أراد الصحابة.

- əl-Hafiz Əbul-Qasim bin Əsakir'dən nəql edir: "Bu hekayə heç də Əbu Abdirrahmən'nin (ən-Nəsai'nin) Muaviyyə bin Əbu Sufyan haqqında mənfi rəydə olduğuna dəlalət etmir. Yalnızca onun adını bütün

hallarda zikr etməkdən çəkindiyinə dəlalət edir. Sonra isnadı ilə Əbul-Həsən Əli bin Muhammməd əl-Qabisi'dən rəvayət edir; dedi: "Əbu Əli əl-Həsən bin Əbil Hiləl'i belə deyərkən eşitdim: "Əbu Abdirrahmən ən-Nəsai'dən Allah Elçisinin - salləllahu aleyhi va səlləm - səhabəsi Muaviyyə bin Əbu Sufyan haqqında soruşanda belə demişdir: "İslam qapısı olan bir evdir və İslamın qapısı səhabələrdir, kim səhabələrə əziyyət verərsə bununla İslamı qəsd etmişdir, necəki qapını döyən insan bununla evə daxil olmaq istəyir" və dedi: "Muaviyyəni qəsd edən elə səhabələri qəsd etmişdir". *(Tarix Diməşq 71-174; əl-Hafiz əl-Mizzi, "Təhzibul-Kəmal", 1/339)*

## 5. Sad'ın (r.a) Əlini (r.a) zikr etməsi və Muaviyyənin (r.a) onu (Əli'ni) söyməsi rəvayəti

İbn Macənin rəvayəti:

قدِمَ معاوية في بعضِ حجَّاته ، فدخَل عليه سعد ، فذكروا عليا ، فنال منه ، فغضِب سعد

"Muaviyyə Həcc üçün gəlmişdi. Sad onun yanına getdi. Məclisdə Əlinin adı zikr edildi. (Muaviyyə) onu söyüb, təhqir etdi. Sad bundan qəzəbləndi".
*(İbni Macə, cild 1, hədis 121)*

**Cavab:**

**a)** Şeyx Zubeyr Əli dedi:

اسناد ضعيف

عبد الرحمن بن سابط لم يسمع من سعد رضى الله عنه

“İsnadı zəifdir. Əbdurrahmən ibni Sabit Sad radiyallahu anh'dan eşitməmişdir. *(Ənvərus səhifə, hədis no 121, səh 380)*

**b)** Şeyx Muqbil ibn Hadi dedi:

هذا الحديث إذا نظرت إلى سنده وجدتهم ثقات، ولكن يحيى ابن معين يقول: إن عبد الرحمن بن سابط لم يسمع من سعد بن أبي وقاص كما في "جامع التحصيل".

“Bu hədisin isnadını gördüyümüzdə, görünür ki, siqə (raviləri var), lakin Yəhya ibn Məin deyir: *"Cəmi ət -Təhsil"*-də deyildiyi kimi, Əbdurrahmən ibni Sabit Sad ibni Əbu Vəqqasdan eşitməmişdir”.
*(Əhədis əl Mualla 1/146 )*

**c)** Şeyx Əbdurrahmən Diməşqi yazır:

والرواية معلولة بالإرسال. فإن فيها عبد الرحمن بن سابط وهو ثقة لكنه كثير الإرسال عن جماعة من الصحابة. وأشار الحافظ المزي إلى ذلك كما في (تهذيب الكمال124/17) وجزم يحيى بن معين بأن ابن سابط لم يسمع من سعد بن أبي وقاص) أنظر جامع التحصيل222/1).

قال الحافظ في التهذيب « قيل ليحيى بن معين: سمع عبد الرحمن من سعد بن أبي وقاص؟ قال: لا. قيل: من أبي أمامة؟ قال: لا. قيل: من جابر؟ قال: لا؛ هو مرسل» (تهذيب التهذيب180/6 ترجمة رقم361).

وقال عنه في التقريب « ثقة كثير الإرسال» (تقريب التهذيب ترجمة رقم3867 ص340 الإصابة228/5).

(بل حكى الحافظ أنه « لا يصح له سماع من صحابي» (الإصابة228/5).

"Bu rəvayət irsal səbəbindən xətalıdır. Çünki, Əbdurrahmən ibni Sabit siqə olsada Səhabənin bir qrupundan çox irsal edər. Hafiz Əl Mizzi *(Təhzib əl Kamal 17/124)*-da buna işarə etmişdir. Yəhya ibni Məin əminliklə bildirib ki, İbni Sabit Sad ibni Əbu Vəqqasdan eşitməmişdir (bax*"Cəmi ət-Təhsil 1/222"*).
Hafiz *"Təhzib"*də dedi: "Yəhya ibni Məindən soruşuldu: "Əbdurrahmən Sad ibni Əbu Vəqqasdan eşitmişmidir?
O dedi: "xeyr".
Ondan soruşuldu: Bəs Əbu Umamədən?
O dedi: "xeyr".
Ondan soruşuldu: "Bəs, Cabirdən?
O dedi: "xeyr" mürsəldir. *(Təhzib ət-Təhzib 6/180 no 261)*

*"Təqrib"*də zikr edildi: "Siqədir, çoxlu irsal edər". *(Təqrib ət-Təhzib no. 3867 səh 340, əl İsabə 5/228)*

Əksinə Hafiz onu zikr edərkən: "Səhabədən nəql etdiyi doğru deyildir" deməkdədir. *(əl İsabə 5/228, Əhədis Yəhtəc bihə əş-Şiyə" 1/343)*

Əgər bu hədis səhih olsaydı Sad ibni Əbu Vəqqas ( r.a) Muaviyyə (r.a) üçün belə deyərdimi?

Sad ibni Əbu Vəqqas dedi:

مَا رَأَيْتُ أَحَداً بَعْدَ عُثْمَانَ أَقْضَى بِحَقٍّ مِنْ صَاحِبِ هَذَا البَابِ -يَعْنِي: مُعَاوِيَةَ

"Osmandan (r.a) sonra Muaviyyədən (r.a) başqa haqqa görə daha yaxşı idarə edən bir kimsə görmədim". *(İbni Əsakir, Tarixi Diməşq 59/161, Hafiz Əbu Yəhya Nurpuri hədisi mötəbər saymışdır)*

Yenə əgər bu hədisi səhih saysaq belə Hz.Muaviyyənin (r.a) bu sözünə nə deməli?

"Muaviyyə dedi: "Vallahi, xeyr. Mən onun (Əlinin) məndən daha üstün olduğunu və idarəçiliyə haqqı olduğunu bilirəm". Lakin, siz bilmirsinizmi ki, Osman məzlum olaraq öldürüldü?" *(Siyər aləm Ən Nubəla, cild 3, səh 140. Kitabın Mühəqqiqi dedi:*رجاله ثقات *- ricalları siqədir, Həmçinin İbni Kəsir bu rəvayəti "Əl Bidayə"sində 8/129-da zikr etmişdir)*

Hz.Muaviyyənin (r.a) özündən üstün sayıb, çətinə düşdüyündə suallarını yönəltdiyi bir kimsəni (Hz. Əlini (r.a)) söydüyü necə düşünüləbilər ki?

İmam Əhməd nəql edir ki, Sad ibni Əbu Vəqqasın (r.a) özü belə deməkdədir:

وَكَانَ بَيْنَ خَالِدِ بْنِ الْوَلِيدِ ، وَبَيْنِ سَعْدٍ كَلامٌ ، وَقَالَ : فَتَنَاوَلَ رَجُلٌ خَالِدًا ، قَالَ : عَبْدُ الرَّحْمَنِ عِنْدَ سَعْدٍ ، قَالَ : فَقَالَ سَعْدٌ : إِنَّ مَا بَيْنَنَا لَمْ يَبْلُغْ دِينَنَا " .

"Tariq ibni Şihab dedi: "Xalid ibni Vəlidlə Sad ibni Əbu Vəqqas arasında mübahisə oldu. Bir adam (Sadın xeyrinə) Xalid əleyhinə danışdı. Sad (Xalidin əleyhinə danışan adama) dedi: "Bizim (səhabənin) ara-

sında başverənlər, dinimizə təsir (zərər) etmir”.
*(Fədail əs-Səhabə, Əhməd no. 1311, Kitabın Mühəqqiqi dedi: "İsnadı səhihdir")*

## 6. Səni Əbu Turabı (r.a) lənətləməyə nə əngəl olur?

*"Səhih Muslim"*də oxuyuruq:

حدثنا قتيبة بن سعيد ، ومُحَمَّد بن عباد – وتقاربا في اللفظ – قالا : حدثنا حاتم وهو ابن إسماعيل – عن بكير بن مسمار ، عن عامر بن سعد بن أبي وقاص ، عن أبيه ، قال : أمر معاوية بن أبي سفيان سعْدا فقال : ما منَعك أن تسُبَّ أبا التراب ؟ فقال : أما ما ذكرتُ ثلاثا قالهن له رسول الله ﷺ فلن أسبُّه ، لأن تكون لي واحدة منهن أحب إلي من حُمْرِ النَّعَم ، سمعت رسولَ الله ﷺ يقول له ، خلَّفه في بعض مغازيه ، فقال له علي : يا رسول الله خلَّفتني مع النساء والصبيان ؟ فقال له رسول الله ﷺ : أما ترضى أن تكون مِني بمنزلةِ هارون مِن موسى ؟ إلا أنه لا نبوة بعدي

وسمعته يقول يوم خيبر لأُعْطِيَنَّ الرايةَ رجلا يحبُ اللهَ ورسوله ، ويحبه الله ورسوله , قال فتطاولنا لها فقال: ادعوا لي عليا , فأتي به أرمدَ ، فبصَق في عينه ودفع الراية إليه ، ففتح الله عليه ، ولما نزلت هذه الآية : {فقل تعالوا ندع أبناءنا وأبناءكم} دعا رسول الله ﷺ عليا وفاطمة وحسنا وحسينا فقال : اللهم هؤلاء أهلي

"2404 - Muaviyyə bin Əbu Sufyan, Sad bin Əbi Vaqqası çağırdı. Muaviyyə ondan soruşdu: Əbu Turabı ( Əlini) səbb etməyə əngəl olan nədir?
Rasulullahın - sallalahu aleyhi və alə alihi və səlləm - onun haqqında zikr etdiyi üç xüsus vardır ki, onları xatırladığım müddətcə mən əsla Əlini söymərəm. Bunlardan hər biri mənim üçün qırmızı dəvələrdən xeyirlidir:

**1.** Rasulullah bəzi savaşlarda onun arxa cəbhədə qalmasına qərar vermişdi. Əli ona dedi: Ey Allahın rəsulu! Məni qadın və uşaqlarla bərabərmi qoyursan? Rəsul belə cavab verdi: ***"Mənim yanımda Harunun Musa yanındakı mərtəbəsindəki kimi olmaq istəmirsənmi? Ancaq məndən sonra peyğəmbərlik yoxdur!"***
**2.** Xeybər günü Rəsul belə dedi: ***"Bu bayrağı elə birinə verəcəm ki, Allahı və Rəsulunu sevir. Allah və Rəsuluda onu sevir." Hamımız bayrağı almağa ümid edirdik. Rəsul dedi: "Əlini yanıma çağırın!"***
Əli gözü xəstə halda gəldi. Peyğəmbər onun gözünə tüpürcəyini sürdü və bayrağı ona verdi. Allah da ona fəthi müyəssər etdi.
**3.** ***"De: Gəlin oğullarımızı və oğullarınızı çağıraq."*** ayəsi nazil olduqda, Rasulullah Əlini, Fatiməni, Həsən və Hüseyni çağırdı və dedi: ***"Allahım mənim ailəm bunlardır".*** *(Səhih Muslim: 4/1871)*

**Cavab:**

İmam Ən Nəvəvi (r.a) bu hədisin şərhində yazır:

فقول معاوية هذا ليس فيه تصريح بأنه أمر سعدا بسبه ، وإنما سأله عن السبب المانع له من السب ، كأنه يقول : هل امتنعت تورعا ، أو خوفا ، أو غير ذلك . فإن كان تورعا وإجلالا له عن السب فأنت مصيب محسن ، وإن كان غير ذلك فله جواب آخر ، ولعل سعدا قد كان في طائفة يسبون فلم يسب معهم ، وعجز عن الإنكار ، وأنكر عليهم ، فسأله هذا السؤال . قالوا : ويحتمل تأويلا آخر أن معناه ما منعك أن تخطئه في رأيه واجتهاده ، وتظهر للناس حسن رأينا واجتهادنا ، وأنه أخطأ ؟ .

"Muaviyyənin bu sözündə onun Sad'a Əlini söyməyi əmr etməsi aydın deyilmir, sadəcə olaraq ondan Əlini söyməyinə maneə olan səbəb haqqında soruşmuşdur. Sanki ondan soruşur ki, "Sən bunu Əliyə qarşı sayğıdan yoxsa qorxudan və ya başqa səbəbə görəmi edirsən?" Əgər sayğı və ona hörmətə görə söymürsənsə o zaman doğru və gözəl edirsən! Əgər səbəbi başqa şeydirsə onun cavabı başqadır. Ola bilsin ki, Sad o zaman Əlini söyən bir qrup insan arasında olmuş və onlara qoşulub söyməmişdir. Onları inkar etmişdir. Muaviyyə də ona bu sualı vermişdir. Başqa alimlər isə deyir ki, burada başqa bir təvil də mümkündür, bu zaman mənası belə olur ki, Əlini rəyində və ictihadında xətalı çıxarmağa və insanlara bizim rəyimizin, ictihadımızın doğru olduğunu göstərməyə maneə olan səbəb nədir?" *(Şərh Səhih Muslim, 15/175)*

İmam əl-Qurtubi - rahiməhullah - Darar əs-Sudai'nin Əlini vəsf etməsi və bunun üzərinə Muaviyyənin ağlamasını zikr etdikdən sonra deyir:

وهذا الحديث يدل على معرفة معاوية بفضل علي رضي الله عنه ومنزلته ، وعظم حقه ومكانته ، وعند ذلك يبعد على معاوية أن يصرح بلعنه وسبه ، لما كان معاوية موصوفاً به من العقل والدين والحلم وكرم الأخلاق وما يروى عنه من ذلك فأكثره كذب لا يصح. وأصح ما فيها قوله لسعد بن أبي وقاص: ما يمنعك أن تسب أبا تراب ؟ وهذا ليس بتصريح بالسب ، وإنما هو سؤال عن سبب امتناعه ليستخرج من عنده من ذلك ، أو من نقيضه ، كما قد ظهر من جوابه ، ولما سمع ذلك معاوية سكت وأذعن ، وعرف الحق لمستحقه.

ولو سلمنا : أن ذلك من معاولة حمل على السَّب ، فإنَّه يحتمل أن يكون طلب منه أن يسبَّه بتقصير في اجتهاد ، في إسلام عثمان لقاتليه ، أو في إقدامه على الحرب والقتال للمسلمين ، وما أشبه ذلك مما يمكن أن يقصر بمثله من أهل الفضل ، وأما التصريح باللعن ، وركيك القول ، كما قد اقتحمه جهَّال بني أمية وسفلتهم ، فحاشا معاوية منه ، ومن كان على مثل حاله من الصحبة ، والدين ، والفضل ، والحلم ، والعلم ، والله تعالى أعلم

“Bu hədis göstərir ki, Muaviyyə Əlinin - radiyallahu anhu - fəzilətini, yüksək məqamını, haqqının böyüklüyünü bilirdi. Beləliklə Muaviyyənin açıqdan onu lənətləməsi və söyməsi uzaq bir ehtimaldır, çünki Muaviyyə ağıl, dindarlıq, mehribanlıq və gözəl əxlaqla vəsf olunmuşdur. Ondan (Əlini söyməsi) barədə və daha da pis şeylər haqqında rəvayət edilənlərə gəldikdə isə bunların hamısı yalandır və heç biri səhih deyildir. Bunların içində ən səhihi onun Sad bin Əbi Vaqqas’a dediyi - ”Əbu Turaba söyməyə sənə maneə olan nədir?” - sözləridir. Bu isə onun Əlini söydüyünü göstərmir.” *(əl-Qurtubi, “əl-Mufhim”, 6/278)*

Alləmə Əbu Abdilləh Muhəmməd bin Əli ət-Təmimi əl-Məziri (hicri 453-536) deyir: “Burada ona söyməyi əmr etməsinə dair aşkar bir ifadə yoxdur, sadəcə olaraq söyməsinə mane olan səbəb haqqında soruşdu. Belə bir sual haqqında soruşulan adamı söyməyi icazəli görəndən soruşulduğu kimi icazəli görməyəndən də soruşula bilər. Ola bilsin ki, Muaviyyə Sad’ı onu (yəni Əlini) söyən bir qövmün yanında görmüş və onların bu işini inkar etməsi müm-

kün olmamışdır. Buna görə də ondan peyğəmbərdən - salləllahu aleyhi va səlləm - rəvayət etdiyi həmin sözləri çıxarmaq üçün ona - “Əbu Turabı söyməyə sənə mane olan nədir?” - sualını vermişdir ki, onun üçün Əlini söyənlərə qarşı hüccət olsun və ordusunun güruhuna qarşı ona əsaslansın və beləliklə də, səhabələrdən bir başqasının dili ilə muradına çatmış olsun.” *(“əl-Mulim bi Fəvaid Muslim”, 3/246-247)*

Məşhur vəzir Alləmə Avnuddin Əbul-Muzaffər Yəhya bin Muhəmməd bin Hubeyra (hicri 499-560) deyir: “Bu hədisdə dəlil vardır ki, Muaviyyə - “Əbu Turabı söyməyinə nə mane oldu?” - sözü ilə Sad’da olanı oyadaraq çıxarmışdır. O, ona sual verəndir. Buna dəlalət edən tərəf odur ki, Sad Əlinin fəzilətlərini zikr etdikdə Muaviyyə onun sözünü inkar etmədi və həmçinin Sad bütün sözlərini tam sərbəstlik ilə, özlüyündə deyinmədən, tam rahat şəkildə söyləyə bilmişdir. Ola bilsin ki, Muaviyyənin Sadın sözü ilə, Sadın Əli haqqında dedikləri ilə öz əhli və davamçıları arasındakı bəzi gənclərə dərs vermək istəməsi uzaq bir ehtimal deyildir. Belə ki, rəvayət edilib ki, o, Əlini tərifləyərdi və deyərdi: “Allahın elçisi - sallallahu aleyhi va səlləm - elmi bir-başa onun ağzına qoyardı.” Aralarındakı gərginliyə baxmayaraq Əlidən ona fətvalar gələrdi və o, Əlinin fəzilətini heç bir zaman inkar etməmişdir. Aralarındakı savaş isə sadəcə fəri bir məsələdəki ictihada dayanır ki, o məsələdə Muaviy-

yə xəta etmiş, Əli isə doğruya isabət etmişdir və bu, onu iman dairəsindən kənara çıxarmaz. *(əl-İfsah an Məanis-Sihah", 1/348)*

Şeyx Əbul-Məali Mahmud Şukri əl-Âlusi deyir: "Muaviyyənin, əmiri (yəni Əlini) - kərramallahu təalə vachəhu - onun ölümündən sonra söyməsi haqqında tarixçilərin nəql etdikləri xəbərlərin nə qədər doğru olduğu göz qarşısındadır. Onlar onun haqqında elə şeylər danışırlar ki, bu sözlərə etibar etmək və onlara əhəmiyyət vermək olmaz, çünki tarixçilər istər çirkin, istərsə də gözəl olsun hər bir şeyi nəql edirlər və səhihlə, uydurma və zəif rəvayətlər arasında fərq qoymurlar. Onların çoxu gecə vaxtı odun yığanlardır, nə yığdığından xəbərsizdirlər. Belə təhlükəli bir məsələdə bu cür xəbərlərə etimad etmək ağıl sahibi bir insana yaraşmaz, qaldı ki, fəzilət sahibi biri belə bir şey etsin! *("Sabbul-Azəb alə Mən Səbbəl-Əshab ", səh: 421)*

Nəzərinizə çatdırmaq istədiyim bir məqam vardır ki, hədisin özündə də Hz.Muaviyyə (r.a) Hz.Əlini (r.a) onun özünün ən sevdiyi künyə olan "Əbu Turab" künyəsi ilə zikr etməkdədir ki ,buda Hz.Muaviyyənin (r.a) Hz.Əliyə qarşı olan sevgisinin təzahürüdür.

Səhl ibni Sad nəql edir:
حَدَّثَنَا خَالِدُ بْنُ مَخْلَدٍ، حَدَّثَنَا سُلَيْمَانُ، قَالَ حَدَّثَنِي أَبُو حَازِمٍ، عَنْ سَهْلِ بْنِ سَعْدٍ، قَالَ إِنْ كَانَتْ أَحَبَّ أَسْمَاءِ عَلِيٍّ ـ رضى الله عنه ـ إِلَيْهِ لأَبُو تُرَابٍ، وَإِنْ كَانَ

لَيَفْرَحُ أَنْ يُدْعَى بِهَا، وَمَا سَمَّاهُ أَبُو تُرَابٍ إِلاَّ النَّبِيُّ ﷺ غَاضَبَ يَوْمًا فَاطِمَةَ فَخَرَجَ فَاضْطَجَعَ إِلَى الْجِدَارِ إِلَى الْمَسْجِدِ، فَجَاءَهُ النَّبِيُّ ﷺ يَتْبَعُهُ، فَقَالَ هُوَ ذَا مُضْطَجِعٌ فِي الْجِدَارِ فَجَاءَهُ النَّبِيُّ ﷺ وَامْتَلأَ ظَهْرُهُ تُرَابًا، فَجَعَلَ النَّبِيُّ ﷺ يَمْسَحُ التُّرَابَ عَنْ ظَهْرِهِ يَقُولُ " اجْلِسْ يَا أَبَا تُرَابٍ ".

“Əlinin (r.a) ən sevdiyi künyəsi Əbu Turab idi. Onu bu adla çağırmamızı xoşlayardı. Ona ilk dəfə bu adı verən Peyğəmbərdən (s.a.s) başqa biri olmamışdır. Bir dəfə Əli Fatimənin yanına girmiş və sonra çıxaraq məsciddə bir divarın yanında yatmışdı. Peyğəmbər (s.a.s) onu axtarmış və bir kimsədə: ”O, (məsciddə) divarın yanında yatır” demişdi. Onun (Əlinin) kürəyi torpağa batmış halda ikən Peyğəmbər (s.a.s) ona getdi. Peyğəmbər Əlinin kürəyindən torpaqları təmizləyərək: ***“Qalx, ey Əbu Turab!”*** - dedi”.

*(Səhih əl-Buxari 6204)*

Səhl ibni Sad nəql edir:

Əbu Həzim Sələmə bin Dinardan rəvayət edir ki, “Bir nəfər Səhl bin Sədin (r) yanına gəlir və: “Mədinə əmiri filankəs minbərin yanında Əli haqqında danışır” - deyir. Səhl: “Bu əmir Əli haqqında nə deyir?” - deyə soruşur. Əbu Həzim: “Əmir Əliyə Əbu Turab deyir” - dedikdə, Səhl ibn Səd güldü və: “Allaha and olsun, Əliyə bu ləqəbi Peyğəmbər vermişdir və Əlinin ən çox bu ad xoşuna gəlirdi” - dedi. Əbu Həzim dedi: “Mən bu ləqəbi peyğəmbərin Əliyə necə verdiyini öyrənməklə ləzzət almaq istədim və Səhl ibn Səddən soruşdum: “Ey Əbu Abbas, bu necə olub?”

O dedi: “Bir dəfə Əli Fatimənin yanına girmiş və sonra çıxaraq məsciddə yatmışdı. Bu vaxt Peyğəmbər gəlib: ***“Əmioğlun haradadır?”*** – deyə soruşdu. Fatimə: “Məsciddədir” - dedi. Peyğəmbər məscidə getdi və Əlinin kürəyi torpağa batmış halda yatdığını gördü. Peyğəmbər Əlinin kürəyindən torpaqları təmizləyərək: ***“Otur, ey Əbu Turab! Otur, ey Əbu Turab!”*** - dedi. *(Buxari; Kitabul-fadail-Əshab 9/51)*

Həmçinin qeyd etmək lazımdır ki, Hz.Muaviyyə Hz.Əlinin (r.a) fəzilətlərindən xəbərdar idi:

İbn Kəsir (r.a) həmçinin Cərir ibn Əbdulhəmid yoluyla əl-Muğirədən nəql edir ki, o dedi:

عندما جاء خبر قتل علي إلى معاوية بن أبي سفيان، بدأ البكاء. وقالت زوجته له: "أنت
البكاء على وفاته، وكنت قد خاض معه؟". فقال: "ويل لك، لا يدركون ما فقد الناس [قبل وفاته] من الفضيلة، الفقه، والمعرفة"

: Əlinin (r.a) öldürülməsi xəbəri Muaviyyəyə (r.a) çatanda o ağlamağa başladı. Xanımı ona dedi: "Sən onun ölümünə ağlayırsan və onunla döyüşmüsən?" (Muaviyyə) dedi: "Vay halına, sən insanların (onun ölümüylə) fəzilətdən, fiqhdən və mərifətdən nələr itirdiyini anlamırsan". *(İbni Kəsir, Əl bidayə və Nihayə)*

Hişam ibni Əmmar nəql etdi ki, Muaviyyə (r.a) Əlinin (r.a) fəzilətləri haqqında dedi:

مُعَاوِيَةَ يَقُوْلُ
لَوْ أَنَّ عَلِيّاً لَمْ يَفْعَلْ مَا فَعَلَ، ثُمَّ كَانَ فِي غَارٍ، لَذَهَبَ النَّاسُ إِلَيْهِ حَتَّى يَسْتَخْرِجُوْهُ مِنْهُ

"Hətta Əli (r.a) bir mağarada inzivaya çəkilməyə qərar versə belə insanlar yenə onu çölə çıxarmağa çalışar və geri gətirərdilər". *(İmam Zəhəbi, Siyər Aləm Ən Nubəla)*

Görüldüyü kimi, Hz.Muaviyyə (r.a) Hz.Əlinin üstünlüyünü qəbul etmiş, onu ən sevdiyi künyə ilə anmış. Zikr etdiyimiz kimi, çətin vəziyyətlərdə ona suallar yönəltmiş və onun ölümünə ağlamışdır.

## 7. Əbdurrahmən ibn Əbdurəbb əl-Kə'bin (Tabein) Muaviyyəni (r.a) tənqid etməsi

Əbdurrahmən ibnul Əbdurəbb əl Kəbi nəql edir:

Rasulullah (s.a.s) dedi.... ***"Kim bir imama beyət edib, səmimiyyətlə sədaqət sözü vermiş isə, əlindən gəldikcə ona itaət etsin. Bir başqası gəlib sonrakıyla munəəzəyə girişəcək olarsa, sonradan çıxanın boynunu uçurun".*** (Ravi Əbdurrahmən) dedi ki: Amr ibni As'a yaxınlaşdım və dedim:

فدنوت منه فقلت له أنشدك الله آنت سمعت هذا من رسول الله ﷺ فأهوى إلى هذا ابن عمك معاوية أذنيه وقلبه بيديه وقال سمعته أذناي و قلبي فقلت له والله يقول يا أيها الذين آمنوا يأمرنا أن نأكل أموالنا بيننا بالباطل ونقتل أنفسنا لا تأكلوا أموالكم بينكم بالباطل إلا أن تكون تجارة عن تراض منكم ولا تقتلوا أنفسكم إن الله كان بكم رحيما قال فسكت ساعة ثم قال أطعه في طاعة الله واعصه في معصية الله

"Sən Allah, bunu Rasulullahdan sən özün eşitmisən? Əllərini qulaqlarına və qəlbinə uzadıb dedi: Onu qulaqlarım eşitdi və qəlbimdə dərk etdi.

Əbdurrahmən ona: Sənin bu əmin oğlu Muaviyyə bizə mallarımızı aramızda batil qaydada yeməyimizi və özümüzü öldürməyimizi əmr edir. Bir halda ki, Allah deyib: ***"Ey iman gətirənlər! Qarşılıqlı razılıqla edilən alış-veriş müstəsna olmaqla, bir-birinizin mallarını haqsız bəhanələrlə (haqsız yerə) yeməyin və özünüzü öldürməyin! Həqiqətən, Allah sizə qarşı mərhəmətlidir!*** *(Nisa,29)* dedim. Amr ibn As bir qədər susub sonra isə dedi: (Muaviyyəyə) Allaha itaətdə ona itaət et, Allaha asilikdə isə ona asi ol.
*(Səhih Muslim, Əmirlik kitabı 10-cu bab, hədis 1844)*

**<u>Cavab:</u>**

İlk olaraq qeyd etmək lazımdır ki, (Tabeindən) olan Əbdurrahmən, imama itaət etmək və əgər başqa bir kimsə ona (xilafət iddiası) ilə qarşı gələrsə, müsəlmanların onu öldürməsi haqqındakı hədisi yanlış anlamışdır. Çünki, Hz.Muaviyyə (r.a) xilafət iddiasında deyildi, əksinə Hz.Osmanın (r.a) qanını axtarmaqda idi. Hz.Muaviyyənin (r.a) özü belə deyirdi:" Mən onun (Əlinin) məndən daha üstün olduğunu və idarəçiliyə haqqı olduğunu bilirəm". Lakin, siz bilmirsinizmi ki, Osman məzlum olaraq öldürüldü? Mən onun xalaoğlusu və qanını axtaranam". *(Fəth əl Bari, 13/92)*

Həmçinin İmam Əl Ayni yazır:

فإنه ولي عثمان بن عفان والمطالب بدمه وهو أحق الناس

"Əlbəttə O (Muaviyyə) Osman ibni Əffanın vəlisi (qo-humu) idi və Osmanın (qatillərinin) qanını tələb ed-irdi və insanlar arasında buna ən çox haqqı olan kimsə idi". *(Umdətul Qari Şərh Səhih Buxari 17/185)*

İmam Nəvəvi (r.a) hədisin şərhində yazır:

المقصود بهذا الكلام أن القائل لما سمع كلام عبد الله بن عمرو، وذكر الحديث في تحريم منازعة الخليفة الأول، وأن الثاني يقتل، فاعتقد هذا القائل هذا الوصف في معاوية لمنازعته علياً رضي الله عنه، وكانت قد سبقت بيعة علي فرأى هذا أن نفقة معاوية على أجناده وأتباعه في حرب علي ومنازعته ومقاتلته إياه من أكل المال بالباطل، ومن قتل النفس، لأنه قتال بغير حق، فلا يستحق أحد مالا في مقاتلته.

"Bu ifadənin mənası, dinləyicinin (tabeinin) Abdul-lah ibni Amr ibnul Əl As'ın ilk xəlifəyə qarşı savaş-manın qadağan olması və özü üçün bunu iddia edib xəlifəyə qarşı savaşanın öldürülməsi barədə sözlərini eşitməsidir. Bunun Muaviyyə ilə Əli arasındakı mü-naşiqəyə tətbiq ediləbiləcəyini düşünürdü, çünki so-nuncu (Muaviyyə) onun beyətini ilk qəbul etmişdi.
Savaş zamanı Muaviyyənin əsgərlərinə və ardıcılları-na xərclədiyi pulun, sərvətin haqsız sərfi kimi olun-duğunu və onların haqlı olmadıqları üçün savaşın birinin digərini öldürmək kimi olduğunu, bu səbəb-dən də onlardan heç birinin savaşmaq üçün pul ha-qq etmədiyini görürdü (düşünürdü)".
*(Şərh Səhih Muslim)*

Tabeinin hədisin mənasını yanlış anlamasında qə-

ribə heçnə yoxdur. Necə ki, buna bənzər hadisələr baş vermişdir. Buna misal olaraq *"Səhih Buxari"*də rast gəlirik ki, Adi ibni Hatim İslamı qəbul etdiyi zaman, hətta o da  bir hədisin mənasını yanlış anlamışdır.

Adiy ibni Hatim deyir ki: ***"Dan yeri söküləndə ağ sap (şəfəq) qara sapdan (gecənin qaranlığından) seçilənə qədər yeyin-için"*** ayəti nazil olduğu zaman biri qara digəri ağ olan iki sap alıb yastığımın altına qoydum. Sahurda bunlara baxır, bunlar bir-birindən ayırd ediləcək qədər dan yeri ağardığında yemək və içməyi buraxırdım. Səhər olunca gedib olanları Rasulullaha (s.a.s) xəbər verdim. Rasulullah (s.a.s) belə buyurdu: ***"Sənin yastığın nə qədərdə böyükmüş! Ayətdə qəsd edilən gündüzün ağlığı və gecənin qaranlığıdır. Bunları yastığının altına necə sığdırdın!"*** *(Səhih əl-Buxari 1916)*

Səhabə və Tabeinin Hz.Muaviyyə haqqındakı fikirləri isə həqiqətdə belədir:

**1.** Möminlərin anası Aişə (r.a) dedi:
**ما زال بي ما رأيت من امر الناس فى الفتنة حتى اني لأتمنى ان يزيد الله عزوجل معاوية من عمري في عمره**

“Fitnə zamanı insanların məsələlərini görəndə, Allahdan Muaviyyənin yaşını mənim yaşıma çatdırmasını arzu etdim”. *(Ət Təbəqat İbni Aruba Əl Hərrani, səh 41)*

**2.** İbni Abbas dedi:

ما رأيت رجلا كان أخلق يعنى للملك من معاوية

"İdarəçilik üçün (4 xəlifədən) sonra Muaviyyədən daha uyğunu görmədim". *(Tarix Diməşq 62/161 Şeyx Zubeyr Əli səhih isnadla Təhqiq, Fədail əs-Səhabə səh 128 -də və Məcallə əl Hədis no: 29 səh 62-də, Musənnəf Abdul Razzəq cild 11 səh 453 no: 20985)*

**3.**

ما رأيت بعد رسول الله ﷺ أسود من معاوية

İbni Ömər dedi: "Rasulullahdan (s.a.s) sonra Muaviyyədən başqa daha Əsvəd bir kimsə görmədim".

İmam Əhməddən Əsvədin mənası haqqında soruşuldu, O dedi: "Onun mənası cömərd (əli açıq) deməkdir". *(Əs-Sünən Əl Xəllal 679, 680, 681, Kitabın Muhəqqiqi dedi, İbni Ömərin ifadəsinin isnadı Həsəndir və Əhmədin ifadəsinin isnadı isə səhihdir)*

**4.** Sad ibni Əbu Vəqqas dedi:

مَا رَأَيْتُ أَحَداً بَعْدَ عُثْمَانَ أَقْضَى بِحَقٍّ مِنْ صَاحِبِ هَذَا البَابِ -يَعْنِي: مُعَاوِيَةَ

"Osmandan (r.a) sonra Muaviyyədən (r.a) başqa haqqa daha uyğun idarə edən bir kimsə görmədim". *(İbni Əsakir, Tarixi Diməşq 59/161, Hafiz Əbu Yəhya Nurpuri hədisi mötəbər saymışdır)*

**5.** Əbu Dərda dedi:

مَا رَأَيْتُ أَحَدًا بَعْدَ رَسُولِ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ ، أَشْبَهَ صَلاةً بِرَسُولِ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ ، مِنْ أَمِيرِكُمْ هَذَا ، يَعْنِي

“Namazında peyğəmbərə - sallallahu aleyhi va səl-ləm - sizin bu əmirinizdən - yəni Muaviyyə’dən - çox oxşayan başqa heç kimsəni görmədim”. *(Əl Heysəmi, Məcməuz Zəvaid 4/285-də dedi: ”Təbərani tərəfindən rəvayət edilmişdir və Qeys ibni Haris əl Münhəcidən başqa ricalları səhihin ricallarıdır və o siqədir”)*

Səhabə və Tabeindən Hz.Muaviyyə (r.a) haqqında bunlara bənzər bir çox ifadələrə rast gəlmək mümkündür.

## 8. Əl-Miqdamın Muaviyyəyə (a.a) nə deyə qızıla, ipəyə və Həsənin (r.a) ölümünə icazə verdiyini soruşması

حدثنا عمرو بن عثمان بن سعيد الحمصي حدثنا بقية عن بحير عن خالد قال وفد المقدام بن معدي كرب وعمرو بن الأسود ورجل من بني أسد من أهل قنسرين إلى معاوية بن أبي سفيان فقال معاوية للمقدام أعلمت أن الحسن بن علي توفي فرجع المقدام فقال له رجل أتراها مصيبة قال له ولم لا أراها مصيبة وقد وضعه رسول الله ﷺ في حجره فقال هذا مني وحسين من علي قال فقال المقدام أما أنا فلا أبرح اليوم فقال الأسدي جمرة أطفأها الله عز وجل حتى أغيظك وأسمعك ما تكره ثم قال يا معاوية إن أنا صدقت فصدقني وإن أنا كذبت فكذبني قال أفعل قال فأنشدك بالله هل تعلم أن رسول الله ﷺ نهى عن لبس الذهب قال نعم قال فأنشدك بالله هل تعلم أن رسول الله ﷺ نهى عن لبس الحرير قال نعم قال فأنشدك بالله هل تعلم أن رسول الله ﷺ نهى عن لبس

قال فوالله لقد رأيت هذا كله في بيتك يا جلود السباع والركوب عليها قال نعم قال خالد فأمر له معاوية فقال معاوية قد علمت أني لن أنجو منك يا مقدام معاوية بما لم يأمر لصاحبيه وفرض لابنه في المائتين ففرقها المقدام في أصحابه قال ولم يعط الأسدي أحدا شيئا مما أخ ذ فبلغ ذلك معاوية فقال أما المقدام فرجل كريم بسط يده وأما الأسدي فرجل حسن الإمساك لشيئه .

النسائي ( 4254 ) // ( 3967

Bizə Amr ibn Osman ibn Səid əl-Himsi nəql etdi, bizə Bəqiyyə (ibn əl Vəlid) nəql etdi, o da Bəhirdən, o da Xaliddən: (Səhabə) Miqdam ibn Madi Kərib ilə Amr ibn əl-Əsvəd və Qinnəsrin əhalisindən olan Əsəd oğullarından bir kişi Muaviyyə ibn Əbu Sufyanın yanına (evinə) gəldilər. Muaviyyə əl-Miqdama dedi: Həsən ibn Əlinin öldüyünü bilirsənmi? əl-Miqdam dedi: "İnnə lilləh və inna ileyhi raciun". Bir kişi (Muaviyyə ibn Əbu Sufyan) ona dedi: Sən onun ölümünü müsibətmi sayırsan?! (əl-Miqdam cavab olaraq Muaviyyəyə) dedi: Mən onun ölümünü necə müsibət saymaya bilərəm?! Rasulullah (salləllahu aleyhi və alih) onu qucağına alıb deyirdi: ***"Bu (Həsən) Məndəndir, Hüseyn də Əlidən".*** Əsəd oğullarından olan dedi: (Həsən) atəş qığılcımı idi ki, Allah onu (öldürməklə fitnəni) söndürdü. (Hədisi nəql edən Xalid) dedi: əl-Miqdam (Muaviyyəyə) dedi: Mən bu gün səni qıcıqlandıran və qəzəbləndirən şeyləri sənə eşitdirməyincə burdan ayrılmayacağam!
əl-Miqdam sonra isə dedi: Ey Muaviyyə! Əgər doğru danışsam mənim sözlərimin doğru olduğunu təsdiqlə və əgər yalan danışsam mənim yalan dediyimi də təsdiqlə. Muaviyyə də dedi ki, oldu.

əl-Miqdam Muaviyyəyə dedi: Allah eşqinə de görüm Rasulullahın (salləllahu aleyhi və alih) kişilərə qızıl üzük taxmağı haram etdiyini bilirsənmi? Muaviyyə dedi bəli. əl-Miqdam: Allah eşqinə de görüm Rasulullahın (sallallahu aleyhi və alih) kişilərə ipək geymələrinin haram etdiyini bilirsənmi? Muaviyyə dedi bəli bilirəm. əl-Miqdam: Allah eşqinə de görüm Rasulullahın (sallallahu aleyhi və alih) vəhşi heyvanların dərilərinin giyinilməsini və onların üzərinə minməyin (oturmağın) haram etdiyini bilirsənmi? Muaviyyə dedi bəli bilirəm. əl-Miqdam dedi: Ey Muaviyyə! Allaha and olsun ki, mən bunların (haramların) hamısını sənin evində gördüm. Muaviyyə dedi: Ey Miqdam! Mən başa düşdüm ki, sənin əlindən qurtara bilməyəcəm. (Hədisi nəql edən) Xalid dedi: Muaviyyə, Miqdamın o iki yoldaşına (pul) verilməsini əmr etdiyindən çoxunu Miqdama verilməsini əmr etdi. Onun oğluna da iki yüz qədərində (pul ) verdi. Miqdam aldıqlarını yoldaşlarına bölüşdürdü. Əsəd oğullarından olan kişi isə aldıqlarından heç kimə bir şey vermədi. Muaviyyə bundan xəbər tutdu və dedi: əl-Miqdam əli açıq (pulunu malını əsirgəmədən verən) kişidir. Əsəd oğullarından olan isə əli möhkəm, bir şey verməyə qıymayan kişidir.

*Mənbə: Sünən Əbu Davud, libas kitabı, hədis 4131, 9/131*

**Cavab:**

Hədisin isnadı haqqında Əl Munzəri dedi:

وَأَخْرَجَهُ النَّسَائِيُّ مُخْتَصَرًا وَفِي إِسْنَادِهِ بَقِيَّةُ بْنُ الْوَلِيدِ وَفِيهِ مَقَالٌ انْتَهَى

"Nəsai qısa sözlərlə rəvayət etmişdir, isnaddakı ravi Bəqiyyə ibni Vəliddə problem vardır". *(Avnul Məbud)*

Şeyx Şueyb Əl Ərnəvut dedi: "Bəqiyyənin zəif olması səbəbindən isnad zəifdir". *(Təhqiq Sunən Əbu Davud , 4131)*

İmam Əhmədin *"Müsnəd"*inin Təhqiqində Şeyx Şueyb Əl Ərnəvut deyir:

إسناده ضعيف بقية - وهو ابن الوليد - مدلس ويسوي وقد عنعن

"İsnad zəifdir, Bəqiyyə ibn Vəlid, Mudəllisdir və təsviyə edərdi, (isnadda) onun (ənən)-əsi vardır".
*(Təhqiq Müsnəd 4/132)*

İbni Kəsir eyni isnad və hədis haqqında deyir:

وقال بقية: عن بجير بن سعيد، عن خالد بن معدان، عن المقدام بن معدي كرب، قال: سمعت رسول الله يقول: «الحسن مني والحسين من علي». فيه نكارة لفظا ومعنى.

"Bəqiyyə Bəhir ibni Səiddən o Xalid ibni Mədəndən o da Əl Miqdam ibni Madi Kəribdən ki, o dedi: "Rasululallahın (s.a.s) belə dediyini eşitdim:
***"Həsən məndən, Hüseyndə Əlidəndir".*** Bu sözlərdə və mənada Nəqarət vardır"(Yəni Münkərdir). *(Əl Bidayə vən Nihayə cild 8 "Əl Həsənin ölümü" bölümünün aşağısında)*

Həmçinin qeyd etmək lazımdır ki, Bəqiyyənin bu

hədisdə zikr etdiyi: ***"Həsən məndən Hüseyndə Əlidəndir"*** sözləridə Səhih hədislə bizə gəlmiş Rasulullahın (s.a.s): ***"Hüseyn məndən, məndə Hüseyndənəm"*** *(ət-Tirmizi (3775), İbn Macə (144) və Əhməd ( 17111)* sözlərinə ziddir.

**a) Muaviyyə (r.a): "Əzab, Həsən ibni Əliyə (r.a) toxunmaz":**

Və Hədisdə keçən Muaviyyəyə aid edilən Sən onun ölümünü müsibətmi sayırsan?! Sözündə də problem vardır. Çünki Hz.Muaviyyənin özü Hz.Həsən (r.a) haqqında demişdir:

" وَإِنَّهُ لَنْ يُعَذَّبَ لِسَانٌ أَوْ شَفَتَانِ مَصَّهُمَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

"Rasulullah (s.a.s) tərəfindən dili və dodaqları öpülən bir kimsəyə (Hz.Həsənə) əzab toxunmaz".
*(Müsnəd Əhməd 28/62, Şueyb Əl Ərnəvut təhqiqində mötəbər saymışdır, Heysəmi "Məcməuz Zəvaid (9/177)"-də dedi : "Əbdurrahmən ibni Əbu Əvf'dən başqa raviləri səhihin raviləridir ki, o (Əbdurrahmən) da siqədir)*

**b) Muaviyyənin (r.a) Əhl'i beytə (r.a) olan hörməti:**

Muhəqqiq Dr. Abdullah ibn Ömər ibn Süleyman əd-Dəmiciyə görə Əl Əcurrinin ***"Əş-Şəriyə"***sində " Muaviyyənin Əhl'i beytə təzimi" adlı bölümdə mötəbər rəvayətlər:

**No 1959:**

مُحَمَّدِ بْنِ عَبْدِ اللَّهِ بْنِ أَبِي يَعْقُوبَ قَالَ: كَانَ مُعَاوِيَةُ رَضِيَ اللَّهُ عَنْهُ إِذَا لَقِيَ الْحُسَيْنَ بْنَ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُمَا , قَالَ: مَرْحَبًا بِابْنِ رَسُولِ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ وَأَهْلًا , وَيَأْمُرُ لَهُ بِثَلَاثِمِائَةِ أَلْفٍ

"Muhəmməd ibni Abdullah ibni Yaqub dedi: "Muaviyyə Həsənlə görüşdüyü zaman dedi: "Mərhaba, Ey Rasulullahın (s.a.s) oğlu, xoş gəldin və ona hədiyyə kimi 300 dirhəm verilməsini əmr etdi". *(Kitabın muhəqqiqi dedi ki, isnadı səhihdir)*

**No 1961**

، عن الزهري قال : لما قتل علي بن أبي طالب رضي الله عنه وجاء الحسن بن علي رضي الله عنهما إلى معاوية فقال له معاوية : لو لم يكن لك فضل على يزيد إلا أن أمك امرأة من قريش وأمه امرأة من كلب لكان لك عليه فضل ، فكيف وأمك فاطمة بنت رسول الله ﷺ

"Zühri dedi: "Əli ibn Əbu Talibin şəhadətindən sonra Həsən ibni Əli Muaviyyə ilə görüşdü və Muaviyyə ona dedi: "Sənin ananın Qureyşdən və onun anasının Kalb (qəbiləsindən) olması sənin Yeziddən üstün olman üçün yetərlidir. Lakin bundan əlavə sənin anan Fatimə (Qureyşli olmasıyla birlikdə), Rasulullahın (s.a.s) qızıdır (Yəni, sən oğlum Yeziddən olduqca üstünsən)". *(kitabın Muhəqqiqi dedi ki, isnadı Həsəndir)*

**No 1963:**

عن جعفر بن محمد عن أبيه أن الحسن والحسين رضي الله عنهما كانا يقبلان جوائز معاوية رضي الله عنه

"Həsən və Hüseyn radiyallahu anhuma Muaviyyədən hədiyyələr qəbul edərdilər". *(Muhəqqiq dedi ki, isnadı Həsəndir)*

**c) Muaviyyə (r.a) insanlara qızıl və ipək geyinməyi qadağan edir:**

Hədisdə: "Mən bunların (ipək paltar,qızıl və s) hamısını sənin evində gördüm" ifadəsi keçməkdədir. İlk olaraq, (Hədisi səhih saysaq belə), bu kimi şeylərin evdə olması günah deyil. Hər ikisi qadınlara halal qılınmışdır. Vacib olan məqam budur ki, "sən bunları geyinirsən" deyilmir, lakin bunları sənin evində görmüşəm" deyə keçməkdədir. Əgər, bir kimsə Muaviyyənin (r.a) bunları geyindiyini iddia etsə belə bu problemlidir, çünki hədis kitablarında zikr edildiyi kimi, bu kimi şeyləri kişilərin geyinməsini qadağan edirdi. Məsələn:

**a)** İmam Əhməd nəql edir:

، عَنْ أَبِي حَرِيزٍ، مَوْلَى مُعَاوِيَةَ، قَالَ: خَطَبَ النَّاسَ مُعَاوِيَةُ، بِحِمْصَ، فَذَكَرَ فِي خُطْبَتِهِ: أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ " حَرَّمَ سَبْعَةَ أَشْيَاءَ، وَإِنِّي أُبْلِغُكُمْ ذَلِكَ وَأَنْهَاكُمْ عَنْهُ، مِنْهُنَّ: النَّوْحُ، وَالشِّعْرُ، وَالتَّصَاوِيرُ، وَالتَّبَرُّجُ، وَجُلُودُ السِّبَاعِ، وَالذَّهَبُ، وَالْحَرِيرُ "

"Bir dəfə Muaviyyə Həmasda xütbə verərkən dedi: " Bu şeyləri sizin aranızda görürəm və Rasulullah (s.a.s) qadağan etdiyi üçün qadağan edirəm"..Yırtıcı heyvanların dərisini geyinməyi...ipək geyinməyi". *(Musnəd Əhməd 28/131, Muhəqqiq Şueyb Əl Ərnəvut dedi:*

*Səhih Liğeyrihi)*

**b)** İmam Nəsai *"Sünən Nəsai"*də "kişilərə qızılın haram olması" babında yazır:

أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ، قَالَ أَنْبَأَنَا النَّضْرُ بْنُ شُمَيْلٍ، قَالَ حَدَّثَنَا بَيْهَسُ بْنُ فَهْدَانَ، قَالَ حَدَّثَنَا أَبُو شَيْخٍ الْهُنَائِيُّ، قَالَ سَمِعْتُ مُعَاوِيَةَ، وَحَوْلَهُ، نَاسٌ مِنَ الْمُهَاجِرِينَ وَالأَنْصَارِ فَقَالَ لَهُمْ أَتَعْلَمُونَ أَنَّ رَسُولَ اللَّهِ صلى الله عليه وسلم نَهَى عَنْ لُبْسِ الْحَرِيرِ فَقَالُوا اللَّهُمَّ نَعَمْ . قَالَ وَنَهَى عَنْ لُبْسِ الذَّهَبِ إِلاَّ مُقَطَّعًا قَالُوا نَعَمْ . خَالَفَهُ عَلِيُّ بْنُ غُرَابٍ رَوَاهُ عَنْ بَيْهَسٍ عَنْ أَبِي شَيْخٍ عَنِ ابْنِ عُمَرَ .

"Əbu Şeyx Əl Huneyi dedi: "Muaviyyə, ətrafında Ənsar və Mühacirlərdən ibarət olan bir topluluğa: Rasulullahın (kişilərə) ipək geyməyi qadağan etdiyini bilirsinizmi? Onlar dedilər: Vallahi, bəli. O dedi: Qırılıb (kiçik parçalara ayrılıncaya qədər) qızıl taxmağı (qadağan etdiyini)? Onlar dedilər: "Bəli".
*(Sünən ən-Nasa'i 5159)*

Bu hədislər Muaviyyənin (r.a) bunları qadağan etdiyinə dəlildir. Özü qadağan etdiyi şeyi necə geyindiyi düşünüləbilərki? Həmçinin bu ifadənin Muaviyyə düşməni olaraq qələmə verilməyə çalışan İmam Nəsainin kitablarında zikr edilməsi təqdirəşəyandır.

**<u>d) Hz.Muaviyyənin geyimini onu görənlər bu cür ifadə etməkdədir:</u>**

İmam Əhməd *"Kitab Əz-Zühd"*-də yazır:

حَدَّثَنَا عَبْدُ اللَّهِ، حَدَّثَنَا أَبُو شِبْلٍ مُحَمَّدُ بْنُ هَارُونَ حَدَّثَنَا حَسَنُ بْنُ وَاقِعٍ، حَدَّثَنَا ضَمْرَةُ، عَنْ عَلِيِّ بْنِ أَبِي حَمْلَةَ، عَنْ أَبِيهِ، قَالَ: رَأَيْتُ مُعَاوِيَةَ عَلَى الْمِنْبَرِ بِدِمَشْقَ يَخْطُبُ النَّاسَ وَعَلَيْهِ قَمِيصٌ مَرْقُوعٌ "

“Əbu Həmlə dedi :”Muaviyyəni minbər üzərində insanlara xütbə verərkən gördüm, köynəyi digər paltarla yamalı idi”. *(Əz-Zuhd no. 965)*

Qısaca özətlərsək:

**1.** Bu Hədis elm əhli arasında müzakirə edilmişdir

**2.** Əgər hədisi səhih saysaq belə, İbni Kəsirin ifadə etdiyi kimi hədisdə problemlər vardır

**3.** Muaviyyə (r.a) Hz.Həsənə (r.a) əzab toxunmaz deməkdədir

**4.** Hz.Muaviyyə (r.a) İslamda kişilərə haram olan qızıl və ipəyin geyinməsini qadağan edirdi

## <u>9. İbni Abbas (r.a) Muaviyyəni (r.a) lənətləmişdirmi?</u>

Muaviyyə (r.a) düşmənləri bu hədisi sitat gətirirlər:

Əhməd b. Osman b. Həkim əl-Əvdi bizə rəvayət etdi və dedi: Xalid b. Məxləd bizə rəvayət etdi və dedi: Əli b. Salih bizə Məysərə b. Həbibdən, o da Minhal b. Əmrdən, o da Səid b. Cubeyrdən onun belə dediyini rəvayət etdi: Mən Ərafatda İbn Abbasla bir yerdə idim. O (İbn Abbas) dedi: "Niyə insanların təlbiyə deməklərini eşitmirəm?" Mən dedim: "Muaviyyədən qorxduqları üçün. " İbn Abbas çadırından  Muaviy-

yəni heçə sayaraq çıxıb dedi: "Ləbbeyk Allahummə Ləbbeyk, Ləbbeykə Allahummə Ləbbeyk, Allah onlara lənət etsin, bu insanlar Əliyə nifrət etdiklərinə görə Sünnəni tərk ediblər!". *(Sünən ən Beyhəqi)*

**Cavab:**

"Lənət (etmək ifadəsi) Beyhəqidən başqa kimsədən rəvayət edilməmişdir. Ravi Xalid ibn Məxləd əl Qətvani "məzkurul hədisdir", lakin qulat şiədir". *(İbn Sa `d, cild.6, səh.283)*

Alimlərə görə Xalid ibn Məxləd siqədir, lakin rəvayətində yalnız qaldığı zaman höccət deyildir, çünki bir çox münkər hədislər rəvayət etmişdir. Məsələn:

İmam Əhməd dedi:
.له أحاديث مناكير
"Münkər hədislər rəvayət etmişdir" ( العلل رواية عبد الله 2: 18 /رقم 1403)

İbn Əbu Hətim dedi:
سألت أبي عن خالد بن مخلد فقال له أحاديث مناكير

"Onun atasına Xalid ibn Məxləd haqqında soruşulduğunda münkər hədislər rəvayət edər demişdir". *( العلل 2/18)*

Əl Əcurri dedi:
" سئل أبو داود عن خالد بن مخلد القطواني ، فقال : صدوق ولكنه يتشيع

“Əbu Davud Xalid ibn Məxləd əl Qətvani haqqında dedi: ”Səduqdur lakin şiədir”. *(Savalat əl Əcurri 1/ 1030)*

Yəni, qısaca o səduqdur, lakin ğulat şiədir və münkər hədislər nəql edir. Xüsusilədə öz batil məzhəbini dəstəkləyən hədisləri nəql etməkdədir.

## 10. İbni Abbas (r.a) Muaviyyəyə (r.a) eşşək demişdirmi?

Bu barədə gətirilən rəvayət isə belədir:

Məşhur Hənəfi fəqihi Əbu Cəfər Ət Tahavi *”Şərhu Məanil Əsər”* adlı kitabında deyir:

عن عطاء قال : قال رجلٌ لابن عباسٍ رضي الله عنهما : هل لك في معاوية أوتَرَ بواحدة , وهو يُريد أن يعِيب معاويةَ , فقال ابن عباس: أصاب معاوية
قيل له : قد روي عن ابن عباس رضي الله عنهما في فعْلِ معاوية هذا ما يدل على: إنكارِه إياه عليه وذلك
عن عكرمةَ أنه قال : كنتُ مع ابن عباسٍ عند معاويةَ نتحدَّث حتى ذهَب هَزِيعٌ من اللّيْل , فقام معاويةُ , فركَع ركعةً واحدةً , فقال ابن عباسٍ : مِن أين تُرى أخَذها الحِمار
وقد يجوز أن يكون قولُ ابن عباسٍ «أصاب معاوية» على التقِية له , أي أصاب في شيءٍ آخرَ لأنه كان في زمَنه , ولا يجوز عليه عندنا أن يكون ما خالفَ فعْلَ رسول الله ﷺ الذي قد علِمه عنه صواباً. وقد روي عن ابن عباس في الوتْر أنه ثلاث

"Əgər deyilsə: ..... Ata dedi: Bir nəfər İbn Abbasa -. radiyallahu anhumə - dedi: Muaviyyənin bir rükət vitr qılması haqda nə deyirsən? Bu adam Muaviyyəni tənqid etmək istəyirdi. İbn Abbas dedi: "Muaviyyə

düzgün etmişdir".
Buna bizim tərəfimizdən belə cavab verilər: İbn Abbasdan - radiyallahu anhumə - Muaviyyənin bu felini rədd etdiyinə dəlalət edən rəvayət vardır:
İkrimə dedi: İbn Abbasla bərabər Muaviyyənin yanındaydım. Gecənin bir bölümü keçənə qədər danışdıq. Sonra Muaviyyə ayağa qalxıb bir rükət (vitr) qıldı. İbn Abbas dedi: Eşşək (yəni Muaviyə) bunu (tək rükət vitr qılma görüşünü) hardan alıb?
İbn Abbasın "Muaviyyə düzgün etmişdir" sözünün təqiyyə olması caizdir/mümkündür. Məqsədi Muaviyyənin başqa bir məsələdə doğru davranmasıydı. Çünki onlar eyni zamanda yaşamışdılar. Bizə görə İbn Abbasın Rasulullahın felinə müxalif olduğunu bildiyi bir şey haqda "düzgün etmişdir" deməsi caiz deyildir. İbn Abbasdan vitrin üç rükət olduğu rəvayət edilmişdir." *(Əbu Cəfər Ət Tahavi: Şərhu Məanil Əsər: 1/286)*

**Cavab:**

Hədisin isnadı belədir:
أبا غسان مالك بن يحيى الهمداني حدثه قال ثنا عبد الوهاب بن عطاء قال أنا عمران بن حدير عن عكرمة أنه قال

Əbū Ğəssan Mālik ibn Yəhyā əl-Həmədani ona nəql etdi: ‘Əbdul Vəhhab ibn ‘Atā’ bizə nəql etdi: ‘İmrān ibn Hudayr mənə İkrimədən nəql etdi ki, o dedi: Bu Məqamlara diqqət yetirmənizi istərdim: Əbu Ğəssan Malik ibn Yəhya Əs-Susi Abdulvəhhab ibn Ata'dan hədis eşitmişmidir? İlk öncə bunu anlamaq gərək.

